***"Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin."***

*(Həşr surəsi, 59/7)*

*Əsla, birinizə məndən bir əmir və ya qadağa nəql edilərsə,"biz Allahın kitabında nəyi tapsaq ancaq ona tabe olarıq"-deyənlərdən olmayın!*

*(Əbu-Davud, Sünnə 5)*

# MÜNDƏRİCAT

## İKİNCİ FƏSİL
## HƏDİS ELMİNƏ AİD BƏZİ TERMİNLƏR

**ÜÇÜNCÜ FƏSİL**
**HƏDİSLƏRİN TƏSNİFATI**

**BEŞİNCİ FƏSİL**
**HƏDİS ƏDƏBİYYATI**

## ÖN SÖZ

*Allaha həmd, kainatın fəxri Muhamməd peyğəmbərə, ailəsinə və əshabına səlat və salam olsun.*

*İslam dini iki əsas üzərində inşa edilmişdir, Quran və Sünnə (Hədis). Quran günümüzə qədər həm yazılaraq, həm də əzbərlənərək nöqsansız şəkildə gəlib çatmışdır. Çünki uca Allah onu qiyamətə qədər mühafizə edəcəyini ifadə edir. Hədislər isə müəyyən zamanlarda əzbərlənərək daha sonra isə yazılaraq sonrakı nəslə çatdırılmışdır. Zaman keçdikcə, mühafizə edilmək zəmanəti olmadığına görə müxtəlif əlavə və müdaxilələrə məruz qalmışdır.*

*Hədisləri lazımı şəkildə anlamaq, zamanına görə izah edə bilmək və Həzrət Peyğəmbərin (s.ə.s) mesajını düzgün şəkildə analiz edə bilmək üçün ilk növbədə tarixi mərhələləri yaxşı tətqiq etmək və öyrənmək lazımdır. Bu tarixi seyr əsnasında hədislərin təlatümlü tərəqqisini anlamaq və ona edilən müdaxilə və əlavələri ayırd edə bilmək üçün hədis metodologiyasının tədris edilməsi labüddür.*

*Azərbaycanda hədislərin metodologiyası, tədqiqi və izahı mövzusunda olduqca az sayda əsər mövcuddur. Biz də bu əksikliyi hiss edərək hədis istilah və qaydalarından bəhs edən kitab qələmə almağı düşündük. Qarşınızdakı bu əsər orta dini ixtisas səviyyəsi üçün nəzərdə tutulmuş hədis metodologiyası haqqında çalışmadır.*

*Ümumiyyətlə texniki məlumatları oxumaq və tətqiq etmək yorucu olduğunu düşünürük. Məhz bunu nəzərə alaraq mövzular izah edilərkən müəyyən sxem və şəkillərdən istifadə etdik. Hər fəslin əvvəlinə fəslə dair suallar, sonuna da fəsli əhatə edən suallar əlavə etdik.*

*Nöqsansız olan ancaq Allahdır. Bu əsərin nöqsansız və xətasız olduğunu iddia etmə cəhalətindən Allaha sığınıram. Yeganə təmannamız ondan ibarətdir ki, bu çalışma bu sahədə cığır mahiyyətində olsun və sədəqeyi-cariyə dəyəri qazansın.*

*Əsərin hazırlanmasında əməyi olan hər kəsə təşəkkür edirəm.*

***Şirinov Rüfət Tacı oğlu***

***Zaqatala-2016***

## BİRİNCİ FƏSİL

## HƏDİS TARİXİ
## (HƏDİSLƏRİN FORMALAŞMASI)

### HAZIRLIQ TAPŞIRIQLARI

1. Ənam surəsinin 91-ci ayəsinin tərcüməsini oxuyun
2. Kəhf surəsinin 110-cu ayəsində qeyd olunan ana mövzu haqqında düşünün
3. “Təbliğ, təşri və təbyin” kəlmələrinin mənalarını lüğətlərdən tapın
4. Həzrət Peyğəmbərin insanlıq vəsfi barəsində düşünün
5. Həzrət Peyğəmbərə itaət etmək nə mənaya gəldiyi düşünün.
6. Səhabə, tabeun və ətbaut-tabeunun hansı əsrləri əhatə etdiyini araşdırın.
7. Səhabənin fəziləti ilə əlaqəli ayə və hədisləri incələyin. Bir ayə və bir hədisi dəftərinizə yazın.
8. Hz. Peyğəmbərin elmə verdiyi əhəmiyyəti araşdırın.
9. Bildiyiniz səhabə adlarını sinif yoldaşlarınızla paylaşın.
10. Muksirun və muqillun terminlərni dini terminlər lüğətindən tapın.

## I. QURANİ-KƏRİMDƏ HƏZRƏT PEYĞƏMBƏR

Qurani-Kərimdə Hz. Peyğəmbərin xüsusiyyətləri fərqli tərəfləri ilə ifadə edilmişdir. Bu bölmədə biz Hz. Peyğəmbərin hədis elmi baxımından daha düzgün anlaşılması üçün vacib sayılan xüsusiyyətlərinə diqqət çəkmək istəyirik. Odur ki, Hz. Peyğəmbərin həm vəsiflərini həm də vəzifələrini düzgün ayırd etmək, onun hədislərini düzgün anlamaq üçün əsasdır.

### A. HƏZRƏT PEYĞƏMBƏRİN VƏSİFLƏRİ

#### 1. BƏŞƏRİ VƏSFİ



Uca Allah peyğəmbərlərini insanların arasından seçmiş və əmrlərini onlar vasitəsilə insanlara çatdırmışdır. Odur ki, bütün peyğəmbərlər Allahın əmrlərini bəşəriyyətə çatdırmaq üçün seçilmiş insanlardır. Peyğəmbərimz (s.ə.s) də hər kəs kimi bir insan idi. Anası və atası vardı. Digər insanlar kimi böyümüş, inkişaf etmiş, evlənmiş və övlad sahibi olmuşdur. Peyğəmbərmizin bu vəsiflərinə bəşəri, yəni insani vəsiflər deyilir.

İnsani xüsusiyyətlərin hamısına sahib Hz. Muhamməd (s.ə.s) də, Allahın insanlara endirdiyi son kitab Qurani-Kərimi bəşəriyyətə təbliğ edən son peyğəmbər (xatəmul-ənbiya)dır. Məhz buna görə də ilahi buyruqları insanlara çatdıran Hz. Muhammədin əhəmiyyətini hər kəs çox yaxşı bilməlidir.

Qurani-Kərim Hz. Peyğəmbərin bəzi bəşəri xüsusiyyətlərinə diqqət çəkir. Məsələn: Qurani-Kərimdə onun sevinməsi, üzülməsi, tələsməsi, səbr etməsi,



**MÜTALİƏ EDİN**

(Müşriklər) dedilər: “Bu necə peyğəmbərdir ki, yemək yeyir, bazarları gəzib dolaşır? Məgər ona özü ilə birlikdə (insanları Allahın əzabı ilə) qorxudan (və onun həqiqi peyğəmbər olduğunu təsdiq edən) bir mələk göndərilməli deyilmi? Yaxud ona (ruzi qazanmaqdan ötrü bazarları dolaşmasın deyə göydən) bir xəzinə endirməli və ya ondan (onun meyvəsindən) yeyib dolanmaq üçün bir bağı olmalı deyildimi?” Zalımlar (müşriklər möminlərə) dedilər: “Siz ancaq ovsunlanmış (buna görə də ağlını itirmiş) bir adama tabe olursunuz!” (Ya Rəsulum!) Bir gör sənin barəndə necə məsəllər çəkdilər! (Səni divanəyə bənzətdilər, peyğəmbərliyinin həqiqi oldudduğunu təsdiq etmək üçün göydən mələk endirilməsini tələb etdilər!) Artıq (doğru yoldan) azdılar və bir daha (haqqa) yol tapa bilməzlər! (Ya Rəsulum!) Əgər istəsə, sənə ondan (müşriklərin dediklərindən) daha yaxşısını - (ağacları) altından çaylar axan cənnətlər verə bilən, sənin üçün qəsrlər yarada bilən Allah nə qədər (uca, nə qədər) uludur! Lakin onlar (təkcə səni deyil) o saatı da (qiyaməti də) yalan saydılar. Biz də o saatı (qiyaməti) yalan hesab edənlər üçün (Cəhənnəmdə) şiddətli bir atəş hazırladıq. (Furqan surəsi 7-11 )

**Yuxardakı ayələrdə Peyğəmbərin (s.ə.s) hansı vəsfi qeyd edildiyini müəyyənləşdirərək müzakirə edin.**

*Hz. Peyğəmbər öz şəxsi ilə əlaqəli həddi aşmağa icazə verməmiş və bu məsələ barəsində çox həssas davranmışdır. O özü ilə əlaqəli belə demişdir: “Mən Abdullahın oğlu Muhamməddəm. Allahın bəndəsi və peyğəmbəriyəm. Məni, Allahın mənə bəxş etdiyi məqamın üstünə çıxarmayın. Bu heç mənim xoşuma gəlmir.”*

(Buxari, ət-Tarix əs-Səğir, I/11)

xəta etməsi kimi bəşəri xüsusiyyətləri qeyd edilmişdir. Bir ayədə belə buyurulur: **De: "Mən peyğəmbərlərin birincisi deyiləm. (Rəbbimin) mənimlə və sizinlə nə edəcəyini bilmirəm (başqa peyğəmbərlər kimi şəhid olacağımı, ölkəmdən qovulacağımı, yaxud küfrə davam etdiyiniz təqdirdə sizə nə cəza veriləcəyini, hansı fəlakətlərə uğrayacağınızı deyə bilmərəm, çünki qeybi ancaq Allah bilir). Mən yalnız mənə vəhy olunana tabe oluram. Mən ancaq (sizi Allahın əzabı ilə) açıq-aşkar qorxudan bir peyğəmbərəm!"** [1]

Tarix boyu peyğəmbərlər cəmiyyətləri doğru yola dəvət etdikcə onlardan möcüzə tələb edilmişdir. Hərçənd ki peyğəmbərlərin söylədikləri ilə əməl etmək üçün qeyri-adi möcüzələrə ehtiyac yoxdur. Peyğəmbərimiz Hz. Muhamməd (s.ə.s) də eyni tələblə qarşılaşmışdır. O, bu cür yersiz tələblər nəticəsində insanların ilahiləşdirilməsindən çəkindiyi üçün hər səfərində Allahı tənzih edərək tələblərə cavab vermişdir. Bu məsələ barəsində İsra surəsi 90-93 ayələrində belə buyrulur: **(Müşriklər) belə dedilər: "Bizə yerdən (Məkkədən) bir bulaq çıxarmayınca yaxud da sənin (ağacları) arasında şırıl-şırıl irmaqlar axan xurma və üzüm bağın olmayınca yaxud, iddia etdiyin kimi, göyü parça-parça edib başımıza endirməyincə, yaxud Allahı və mələkləri (peyğəmbərliyinin doğruluğuna şahid olaraq) açıq-aşkar qarşımıza gətirməyincə və ya qızıldan bir evin olmayınca, yaxud sən göyə qalxmayınca (biz sənə iman gətirməyəcəyik). Əgər bizə (səmadan) oxuyacağımız bir kitab endirməsən, göyə qalxmağına da əsla inanmayacağıq! (Ya Rəsulum!) De: "Rəbbim pakdır, müqəddəsdir! (Allah gedib-gəlmək, enib-qalxmaq kimi məxluqata aid olan xüsusiyyətlərdən uzaqdır!) Mən isə yalnız peyğəmbər olaraq göndərilən bir insanam!"**

Peyğəmbərlər də hər kəs kimi insandır. Buna baxmayaraq müşriklər peyğəmbərlərin insanlardan yox, ölümsüz olan mələklərdən olmasını doğru qəbul edirdilər. Qurani-Kərimdəki peyğəmbərlərlə əlaqəli hekayələr, Hz. Peyğəmbərin müxatabları ilə üzləşdiyi problemlərə nümunə təşkil edir. Məsələn, Qurani-Kərimdə Nuh peyğəmbərin qövmünün iddialar belə dilə gətirilir: **"(Nuh)**

*İbn Əbu Məsud belə rəvayət edir: Bir gün Rəsulullahın yanına bir adam gəldi və onunla söhbət etdi. Bu əsnada qorxudan o adamın çiyinləri titrəməyə başladı. Bu vəziyyəti müşahidə edən Rəsulullah (s.ə.s) ona belə dedi: " Qorxma! Mən Kral deyiləm. Mən qurudulmuş ət (qədid) yeyən bir qadının oğluyam."*

(İbn Macə, Ətimə, 30)

**MÜTALİƏ EDİN**

Nə üçün Peyğəmbər mələklərdən yox, insanlardan seçilmişdir? Aşağıdakı ayələri də nəzərə alaraq müzakirə edin.

İnsanlara doğru yolu göstərən bir rəhbər gəldiyi zaman ona iman gətirməyə mane olan şey yalnız onların: "Allah bir insanımı peyğəmbər göndərdi?" - deməleridir. (Ya Rəsulum!) De: "Əgər yer üzündə dolaşanlar mələklər olsaydı sözsüz ki, onlara bir mələk peyğəmbər göndərərdik!" (İsra, 17/ 94,95)

Onlar dedilər: "Məgər ona bir mələk endirilməli deyildimi?" Əgər Biz bir mələk göndərsəydik, iş bitmiş olar və (tövbə etmək üçün) onlara bir an belə möhlət verilməzdi. Əgər Biz onu (peyğəmbəri) mələk etsəydik, yenə də onu bir insan qiyafəsində göndərər və onları bir daha düşdükləri şübhəyə salardıq. (Ənam, 6/ 8, 9)

1 Əhqaf, 46/ 9.

**YADDA SAXLA**

**Peyğəmbərə (s.ə.s) aid olan bəşəri xüsusiyyətlər**

- Uşaqları qucağına alıb oxşatması
- Xəstələri ziyarət etməsi və onların şəfa tapması üçün dua etməsi
- Bir məclisə getdikdə boş yerdə əyləşməsi
- Ayaqlarını başqalarına tərəf uzatmaması
- Sökülən paltarını tikməsi və yamaması
- Ev işlərində xanımlarına kömək etməsi
- Gələn qonaqlara şəxsən özünün xidmət etməsi
- Həyatı boyu heç kimi tənqid etməməsi
- Başqaları danışarkən onları könül rahatlığıyla dinləməsi və sözünü kəsməməsi
- Bədən və diş təmizliyinə diqqət etməsi
- Heç kimdən intiqam almaması
- Hər kəsə salam verməsi
- Yatmadan əvvəl "İxlas, Fələq və Nas" surələrini oxuyub başından ayağına kimi məsh etməsi və s.

**qövmünün kafir başçıları dedilər: "Bu sizin kimi yalnız adi bir insandır. Sizə böyüklük etmək istəyir. Əgər Allah istəsəydi, (bizə peyğəmbər olaraq insan deyil) mələklər göndərərdi. Biz bunu ulu babalarımızdan (keçmiş ümmətlərdən) eşitməmişik."**[2] Ancaq ilahi əmrləri yerinə yetirmək üçün Peyğəmbərləri nümunə götürmək zəruridir. Bir mələyi nümunə götürmək isə qeyri-mümkündür.

Qurani-Kərimdə Hz. Peyğəmbərin bir bəşər olduğu açıq şəkildə ifadə edilmişdir. Həmçinin özü də bu mövzuya həssas yanaşmışdır. Məsələn Hz. Ömərdən rəvayət edilən bir hədisdə Rəsulullah (s.ə.s) belə buyurmuşdur: *"Xristiyanların Məryəm oğlu İsanı fövqəladə təriflədikləri kimi məni tərifləməyin. Bu bir həqiqətdir ki, mən bir bəndəyəm. Mənə "Allahın bəndəsi və elçisi" deyin"*[3] Beləliklə Hz. Peyğəmbər, əhli kitabın peyğəmbərləri barəsindəki yanlışlara diqqəti cəlb edərək ümmətinə xəbərdarlıq etmişdir. Eyni zamanda özünün barəsində Allahın rəsulu olmasıyla yanaşı, onun qulu olduğunun da vurğulanmasını tələb etmişdir.

Quranda "**Deki məndə bir insanam**..."[4] buyrularaq Hz. Peyğəmbərin bir insan olduğuna işarə olunmuşdur. Məsələn, o, ətrafındakı insanlara "dostum, yoldaşım" demiş, Qurani-Kərim də bunu təsdiq etmişdir.[5] Onun yoldaşları ilə davranışları, vəfa və dostluq nümunələri ilə doludur.[6] Hz. Peyğəmbər də onlar kimi yaşayan

**MÜZAKİRƏ EDİN**

Aşağıdakı ayəni də nəzərə alaraq Quranın Hz. Peyğəmbəri yeyən, içən, bazarda gəzən biri kimi tanıtmasının səbəblərini müzakirə edin.

**De: "Mən sizə demirəm ki, mənim yanımda Allahın xəzinələri vardır. Mən qeybi bilmirəm və sizə də demirəm ki, mən mələyəm. Mən yalnız özümə gələn vəhyə tabe oluram".** (Ənam surəsi, 50)

***Ya Rəsulum! Biz Səni bütün aləmlərə ancaq rəhmət olaraq göndərdik.***
(Ənbiya, 21/107)

***"...O, Allahın Rəsulu** (elçisi) **və peyğəmbərlərin sonuncusudur..."***
(Əhzab, 33/40)

2 Möminun, 23/ 24.
3 Buxari, Ənbiya, 48
4 Fussulət, 41/6
5 Tövbə, 9/40; Səbə, 34/46; Təkvir, 81/ 22; Nəcm, 53/ 2; Nisa, 4/69.
6 Tövbə, 9/128.




biri olduğu üçün onlarla dərd ortağı olmuşdur. Onlarla bərabər ağlayıb-gülmüşdür. Yoldaşları onu dövlət rəisi, ordu komandiri, ailə başçısı, uşaqlarının atası, nümunəvi qonşu və yoldaş kimi bir çox mövzuda örnək almışdılar. Hz. Peyğəmbər digər insanlara ona arxayın olmamağı buyurmuşdu. Məsələn onun bəzi rəvayətlərdə " Ey Fatimə, Səfiyyə, Qureyş, Filan oğulları" xitabı ilə başlayan nitqləri "Mən Allahın hüzurunda sizi qurtara bilmərəm"[7] ifadəsi ilə bitmişdir. Bu mənada ailə fərdləri də daxil, bütün yoldaşlarını öhdəliklərini yerinə yetirməyə və hesabını verə biləcək davranışlar sərgiləməyə sövq etmişdir.

***Həqiqətən, Allah və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər** (xeyir-dua verirlər)**. Ey iman gətirənlər! Siz də ona salavat göndərib** (onun şanını ucaltmağa səy göstərin) **layiqincə salamlayın!*** (Əhzab, 33/56)

## 2. NƏBƏVİ VƏSFİ

Peyğəmbərləri digər insanlardan ayıran ən əsas xüsusiyyət, onların Allahdan vəhy almasıdır. Bu mənada uca Allah Hz. Muhammədi də digər insanlar arasından seçmiş və ona peyğəmbərlik vəzifəsi vermişdir. Qurani-Kərim bu həqiqəti belə təstiqləyir: **"Muhamməd Allahın Rəsuludur."**[8]

Peyğəmbərlik insanların iradəsinə bağlı deyil. Peyğəmbərlər Allah tərəfindən seçilir. Bu mövzu barəsində İbrahim surəsinin 11-ci ayəsində belə buyurulur: **"... Lakin Allah Öz bəndələrindən dilədiyinə peyğəmbərlik bəxş edər".** Allah tərəfindən göndərilən vəhylər barəsində peyğəmbərlərin seçib bəyənmə hüquqları yoxdur. Uca Allah Qurani-Kərimdə Hz. Peyğəmbərdən, Özündən vəhy yolu ilə aldığı buyuruqları əskiltmədən, gizlətmədən olduğu şəkildə insanlara çatdırmağı belə tələb edir: " **Əgər o (Peyğəmbər) özündən bəzi sözlər uydurub Bizə isnad etsəydi, Biz ondan mütləq şiddətli intiqam alardıq."**[9]

Hz. Peyğəmbər bəşəriyyət üçün Uca Allahın rəhmətinin nişanəsidir. Onlara qarşı ədalətli rəftar etmiş və Allahdan aldığı vəhyləri ayrı seçkilik etmədən hər kəsə çatdırmışdır. Bu məsələ barəsində Ənbiya surəsinin 109-cu ayəsində belə buyurulur: **"...(Mənə vəhy olunanı) sizə olduğu kimi (hamıya eyni dərəcədə) bildirdim**..."

Peyğəmbərlərin Allahın buyruqlarına muxatab olma baxımından digər insanlardan fərqi yoxdur. Onlar da digər insanlar kimi Allahın əmrlərinə boyun əyməlidirlər. Bu mənada Qurani-Kərimdə **"(Özlərinə) peyğəmbər göndərilən ümmətləri sorğu-suala çəkəcək, göndərilən peyğəmbərləri də sorğu-sual edəcəyik."**[10] buyrularaq

MÜZAKİRƏ EDİN.

Aşağıdakı sualların cavabları barəsində yoldaşlarınızla müzakirə edin.

- Ayələrə görə Hz. Peyğəmbəri digər insanlardan ayıran ən əsas xüsusiyyət nədir?
- Hz. Muhammədin vəhy alan bir insan olması ilə nümunəviliyi arasında nə kimi münasibət var?

7 Müslim, İman 350.
8 Fətih, 48/ 29.
9 Həqqa, 69/44-45.
10 Əraf , 7/ 6.

onların da məsuliyyət daşıdıqları və gördükləri işlərinə görə hesaba çəkiləcəkləri vurğulanmışdır. Bu mənada Hz. Peyğəmbər də hesaba çəkiləcəyinin fərqində olduğu üçün bütün məsuliyyətləri lazımlı şəkildə yerinə yetirmiş və özünə fərqli rəftar göstərilməməsini istəmişdir.

Hz. Peyğəmbərin Allahın rəsulu olduğunu qəbul etmək iman əsaslarındandır. Möminlər " Mən şahidlik edirəm ki, Muhamməd Allahın bəndəsi və rəsuludur" deyərək onun Allahdan aldığı vəhyə bizə çatdırdığını qəbul etmiş sayılırlar.

**QEYD EDİN.**

Hz. Peyğəmbəri digər insanlardan və peyğəmbərlərdən ayıran xüsusiyyətlər:

1. Son Peyğəmbər olması. (Xatəmul-Ənbiya) . (Əhzab33/40)
2. Gətirdiyi dinin (risalətin) ümumbəşər olması.( Səbə, 34/ 28.)
3. Rəsulus-səqaleyn olması. Yəni risalətinin insanlarla bərabər cinləri də əhatə etməsi.
4. Aləmlərə rəhmət olaraq göndərilməsi (Ənbiya, 21/ 107.)
5. Allahın və mələklərin ona salat-salam etməsi.( Əhzab,33/56.)
6. Hər daim ilahi nəzarətdə olması (Tur, 52/48)

**SIRALAYIN**




*Allah və Peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək yaraşmaz. Allaha və Onun Peyğəmbərinə asi olan kəs, şübhəsiz ki, (haqq yoldan) açıq-aydın azmışdır!*

(Əhzab, 33/36)

## B. Hz. PEYĞƏMBƏRİN VƏZİFƏLƏRİ

### 1.QURANİ-KƏRİMİ TƏBLİĞ ETMƏK

**MÜZAKİRƏ EDİN**

Vəhylərin insanalar təbliğ edilməsində "Təbliğ və etimadlı olma" münasibətlərini yoldaşlarınızla müzakirə edin

Təbliğ kəlməsinin lüğət mənası, daşımaq, götürmək, çatdırmaqdır. Hz. Peyğəmbərin (s.ə.s) əsas vəzifələrindən biri də təbliğdir. Allah peyğəmbərini ona çatdırılanı təbliğ etməklə vəzifələndirmişdir. Allah onu vəzifəni icra etməyə çağırmış və üzləşəcəyi təhlükələrə qarşı onu mühafizə edəcəyini belə ifadə etmişdi.:**"Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil ediləni (Quranı) təbliğ et. Əgər (bunu) etməsən, (Allahın) risalətini yerinə yetirmiş olmazsan Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz!** [11]

Hz. Peyğəmbər (s.ə.s) təbliğ vəzifəsini yerinə yetirməklə məsuldur, amma insanların bunu qəbul etməmələrindən məsul deyildir. O inananlardan ona könüllü surətdə təslim olub inanmalarını gözləmişdir. Onun vəzifəsi insanlara nəsihət etmək və onları doğru yola dəvət etməkdir, onları məcbur etmək deyil. Onun sadəcə təbliğ etməklə məsul olması Qurani-Kərimdə belə qeyd edilmişdir: **"Ya Peyğəmbər!. Əgər (bu müşriklər sənin dəvətindən) üz döndərsələr (əsla ürəyini qısma). Biz səni onlara gözətçi göndərməmişik. Sənin öhdənə düşən ancaq (risaləti) təbliğ etməkdir."**[12]

*(Mömin) qardaşınla münaqişə etmə, onun xoşuna gəlməyəcək zarafatlar etmək və ona yerinə yetirməyəcəyin bir sözü vermə.*
(Tirmizi, Birr, 58)

Allah ayələri insanlara təbliğ etmək üçün Rəsulullahı cəsarətləndirmiş və onu dəstəkləmişdir. Beləliklə Rəsulullah hər cür çətinliyə sinə gərmiş və təbliğatını da açık şəkildə aparmışdır. Qurani-Kərimdə Peyğəmbərlər " **Allahdan başqa heç kimdən qorxmayanlar**"[13] ifadəsi ilə tanıdılır. Bu kimi vəsifləri onlara təbliğ və bəyan vəzifələrini ən yüksək səviyyədə yerinə yetirməyə kömək etmişdir.

**MÜTALİƏ EDİN**

Aşağıdakı ayələri Hz. Peyğəmbərin tətbiq etdiyi təbliğ metodları baxımından izah edin.

***"Ya Peyğəmbər! Öyüd-nəsihət ver. Sən ancaq öyüd-nəsihət verənsən!"*** (Ğaşiyə, 88/22)

***"Biz onların nə dediklərini çox gözəl bilirik.*** *(Ya Peyğəmbər!)* ***Sən onlara zor edən deyilsən. Sən Mənim təhdidimdən qorxanlara Quranla öyüd-nəsihət ver!"*** (Qaf, 50/45)

*"(Ya Peyğəmbər!)* ***Əgər üz döndərsələr bil ki, biz səni onlara gözətçi göndərməmişik. Sənin öhdənə düşən ancaq*** *(risaləti)* ***təbliğ etməkdir."*** (Şura, 42/48)

11 Maidə, 5/67.
12 Şura, 42/48.
13 Əhzab, 33/ 39.

Rəsulullahın etimadlı şəxsiyyəti onun təbliğatında önəmli məqama sahibdir. Qurani-Kərim Əraf surəsi 68-ci ayəsində onun bu vəsfini belə dilə gətirmişdir: **“Mən sizə Rəbbimin əmrlərini təbliğ edirəm. Mən sizin yaxşılığınız üçün doğru məsləhət verənəm.”**

## 2. İLAHİ ƏMRLƏRİ İZAH ETMƏK (TƏBYİN )



Hz. Peyğəmbərin (s.ə.s) digər vəzifəsi də özünə endirilən Quran ayələrini insanlara açıqlamaqdır. Bütün peyğəmbərlər söz və davranışları ilə bunu yerinə yetirmişdir. Hz. Peyğəmbər də lazım gəldiyi məqamlarda təbliğ etdiyi vəhyin mənasını insanlara izah etmişdir. Quranda Peyğəmbərin bu vəzifəsi belə ifadə olunur: **“…Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni (hökmləri, halal-haramı) izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!”.**[14] Bundan başqa onun həyat tərzi də Qurana uyğun idi. Odur ki, onun yaşayış şəklini də Quranın əyani izahı kimi qəbul edə bilərik.

Bütün peyğəmbərlər öz qövmlərindən seçilmişdir. Məhz buna görə də vəhylər o qövmün danışdığı dildə endirilirdi. Əlbətdə bu da onlara ilahi əmrləri daha yaxşı izah etməyə imkan yaradırdı. Qurani-Kərimdə buyurulur: **“Biz hər bir peyğəmbəri yalnız öz millətinin dilində (danışan) göndərdik ki, (Allahın əmrlərini) ona izah edə bilsin...”**[15]




*(Yaşca) kiçiklərimizə şəfqət göstərməyən, böyüklərimizin şərəfini tanımayan (onlara hörmət etməyən) bizdən deyildir”.*
(Əbu Davud, Ədəb 58; Tirmizi, Birr 15)



## 3. HÖKM QOYMAQ (TƏŞRİ)

Peyğəmbərlərin vəzifələrindən biri də “təşri” hökm qoymaqdır. Peyğəmbərlər yaşadıqları cəmiyyətlərdə meydana gələn və üzləşdikləri problemləri həll etmişdirlər. Onların təbliğ və izah etmək vəzifələri ilə yanaşı hökm qoymaq səlahiyyətləri də var. Bu mövzu ilə əlaqəli Əraf surəsinin 157-ci ayəsində belə buyrulur: **(O Peyğəmbər) onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz (pak) nemətləri halal, murdar (napak) şeyləri haram edər, onların ağır yükünü yüngülləşdirər və üstlərindəki buxovları açar (şəriətin çətin hökmlərini götürər). Ona (o Peyğəmbərə) iman gətirən, yardım göstərən və onunla (Quranın) ardınca gedənlər məhz onlar nicat tapanlardır!»** Həmçinin Həşr surəsinin 7-ci ayəsində də **“Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun...”** buyurularaq Peyğəmbərin (s.ə.s) halal və haram qılmaq səlahiyyətinin

14 Nəhl, 16/44.
15 İbrahim, 14/4.

olduğu açıq şəkildə bəyan edilmişdir. Məsələn, eşşək ətinin haram olmasını biz Rəsulullahın hədislərindən öyrənirik.

Bütün peyğəmbərlər kimi Hz. Muhamməd (s.ə.s) də vəzifəsini icra edərkən heç kimdən maddi mənfəət istəməmişdir. Onların bu davranışları səmimi və dürüst olmalarının nişanəsidir. Onlar bu vəzifələrini tamamilə Allah rizası üçün icra etmişdilər.

**İZAH EDİN**

***"Aralarında hökm vermək üçün Allahın** (Allahın kitabının) **və Peyğəmbərinin yanına çağırıldıqları zaman möminlərin sözü ancaq: "Eşitdik və itaət etdik!" - deməkdən ibarətdir. Nicat tapanlar da məhz onlardır! Allaha və Onun Peyğəmbərinə itaət edənlər, Allahdan qorxub çəkinənlər - məhz belələri uğura çatanlardır "*** (Nur, 24/51-52)

Yuxarıda qeyd olunan ayələri Hz. Peyğəmbərin hökm qoymaq səlahiyyətini də diqqətə alaraq izah edin.

*Allah sizin xarici görünüşünüzə və sərvətinizə baxmaz. O, ancaq sizin qəlbinizə və əməllərinizə baxar.*

(Müslüm, Birr, 33; İbn Macə, Zöhd, 9; Əhməd b. Hənbəl, 2/285, 539)

بلغوا عني ولو آية

***"Mənim adımdan bir ayə də olsa təbliğ edin!"***

### C. HZ. MUHAMMƏDƏ (s.ə.s) İTAƏT ETMƏK

Allaha itaət etmək onun əmr və qadağalarına riayət etmək deməkdir. Uca Allah peyğəmbərinə itaəti də özünə itaət kimi qəbul etmişidir. Qurani-Kərimdə bu həqiqət **"Kim peyğəmbərə itaət edərsə Allaha itaət etmiş sayılar..."**[16] şəklində ifadə edilmişdir. Bu ayədən başa düşürük ki, Rəsulullaha itaət etmək, yəni onun əmrlərinə və qoyduğu qanunlara itaət etmək, Allahın fərz buyurduğu bir ibadətdir. Peyğəmbərsiz din nöqsandır. Dini düzgün qavramaq və yaşamaq üçün peyğəmbərə itaət şərtdir. Məhz buna görə də peyğəmbərə itaət Allaha itaət kimi qəbul edilmiş və ona itaət etmək tələb edilmişdir. Peyğəmbərin yolu Allahın yoludur. Peyğəmbərin izi ilə getmək İlahi bəyanın kölgəsində ömür sürməkdir. Odur ki, sünnəni qəbul etməmək, onu təcrid etmək və ya ona üsyan etmək Allaha üsyan deməkdir.

Həmçinin Allah özünə olan sevgini peyğəmbərinə itaət edərək nümayiş edilməsini istəyir. Hətta ona bağlılıq və hörmətin bağışlanma səbəbi olduğunu ifadə edir. Bu həqiqət Quranda belə ifadə edilmişdir: **De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah bağışlayandır, mərhəmətlidir. Söylə: "Allaha və Peyğəmbərə itaət edin!..**[17] Allah Rəsulunə edilən itaətin qarşılığını verəcəyini ifadə edir. Nisa surəsinin 13-cü ayəsində **"Hər kəs Allaha və Peyğəmbərinə itaət edərsə, Allah onu altından çaylar axan cənnətlərə əbədi olaraq daxil edər ki, bu da (möminlər üçün) böyük qurtuluşdur."** buyrularaq qurtuluşa və rəhmətə nail olmaq üçün yeganə yolun Peyğəmbərə itaət etmək olduğu ifadə edilmişdir.

Göründüyü kimi Qurani-Kərimdə Rəsulullaha (s.ə.s) itaət etmək önəmli vəzifə kimi nəzərə alınmışdır. Bu mənada uca Allah inananları, Rəsulullaha qarşı gəlməkdən çəkindirmişdir.[18] Ona edilən müxalifətin ayələri inkar etmək olduğu ifadə edilmişdir. Nisa surəsinin 115-ci ayəsində Rəsulullaha (s.ə.s) itaət etməyin əhəmiyyəti belə qeyd edilmişdir: **"Hər kəs özünə doğru yol aşkar olandan sonra Peyğəmbərdən üz döndərib möminlərdən qeyrisinin yoluna uyarsa, onun istədiyi (özünün yönəldiyi) yola yönəldər və Cəhənnəmə varid edərik. Ora necə də pis yerdir."** Beləliklə Peyğəmbərə qarşı gəlməyin nəticələri vurğulanaraq bütün insanlar bu müxalifətçiliklərdən çəkindirilmişdir.

*Allah, sizin hamınızın yaxşı və sağlam iş, əməl və vəzifə görmənizdən şad olur.*

(Təbərani, Əl Mucəm'ül- Əvsat. 1/275; Bəyhaki, Şuabu'l- İman, 4/334.)

**İZAH EDİN**

Aşağıdakı ayəni Hz. Peyğəmbərə hörmət pəncərəsindən baxaraq izah edin:

***Həqiqətən, möminlər ancaq Allaha və Onu Peyğəmbərinə iman gətirən, ümumi bir iş*** *(cihad, cümə xütbəsi, məsləhət-məşvərət)* ***üçün Peyğəmbərlə bir yerdə olduqda ondan izin almamış bir yerə getməyən kimsələrdir... Peyğəmbəri çağırmağı öz aranızda bir-birinizi çağırmağınızla eyni tutmayın! Həqiqətən, Allah sizlərdən xəlvət sovuşub aradan çıxanları bilir. Onun əmrinə qarşı çıxanlar başlarına gələcək bir bəladan, yaxud düçar olacaqları şiddətli bir əzabdan həzər etsinlər!*** (Nur,24/61-62)

16 Nisa, 4/ 80.
17 Ali imran, 3/ 31-32
18 Tövbə, 9/63; Ənfal, 8/13; Nisa, 4/14; Talaq, 65/8.



Qurani-Kərimdə eyni zamanda Hz. Peyğəmbərin möminlər arasında baş verən ixtilafların həll edicisi olduğu da açıq şəkildə vurğulanmışdır. Bu mənada möminlərdən ona tam təslim olmaq tələb edilir. Nisa surəsinin 64 və 65-ci ayələrində belə buyrulmuşdur: **Biz hər bir peyğəmbəri, ancaq ona Allahın izni ilə itaət olunsun deyə, göndərdik. Onlar (münafiqlər) özlərinə zülm etdikləri zaman dərhal sənin yanına gəlib Allahdan bağışlanmaq diləsəydilər və Peyğəmbər də onlar üçün əfv istəsəydi, əlbəttə, Allahın tövbələri qəbul edən, mərhəmətli olduğunu bilərdilər. Amma, xeyr! (Ya Rəsulum!) Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim (münsif) təyin etməyincə və verdiyi hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə, (həqiqi surətdə) iman gətirmiş olmazlar.**

*Allaha və axirət gününə iman gətirən kəs, qonşusuna əziyyət etməsin. Allaha və axirət gününə iman gətirən kəs, qonağına hörmət etsin. Allaha və axirət gününə iman edən kəs ya xeyir söyləsin və ya sussun.*

(Buxari, Ədəb, 31, 85; Müslüm, İman 74, 75)

**İZAH EDİN**

Aşağıdakı ayəni izah edərək " Hz. Peyğəmbərə hörmət etmək" mövzusunda inşa yazın.

***"Ey iman gətirənlər! Allahdan və Peyğəmbərindən önə keçməyin. Allahdan qorxun. Həqiqətən, Allah eşidəndir, biləndir! Ey iman gətirənlər! Səsinizi Peyğəmbərin səsindən artıq qaldırmayın və bir-birinizlə ucadan danışdığınız kimi onunla ucadan danışmayın! Yoxsa, özünüz də bilmədən, əməlləriniz puç olar. Həqiqətən, Allahın Peyğəmbəri yanında astadan danışanlar*** *(səslərini asta çıxardanlar)* ***o kimsələrdir ki, Allah onların ürəklərini təqva üçün imtahana çəkmişdir Onları*** *(günahlardan)* ***bağışlanma və böyük mükafat*** *(Cənnət)* ***gözləyir!*** *(Ya Peyğəmbər!)* ***Şübhəsiz ki, səni otaqların arxasından çağıranların çoxusunun ağlı kəsmir! . Əgər onlar sən qarşılarına çıxancaya qədər səbr etsəydilər,*** *(bu, Allahın yanında)* ***onlar üçün, əlbəttə, daha yaxşı olardı. Allah*** *(tövbə edənləri)* ***bağışlayandır, rəhm edəndir!"*** (Hucurat, 49/1-5)

Buraya qədər olan izahlarda da göründüyü kimi, Allah ayələrində Rəsulullaha (s.ə.s) qətiyyətlə itaət etmək və onu rəhbər seçməyi əmr etmişdir. Bu səbəblə İslam ancaq Quranla birlikdə Sünnəyə də riayət olunmaqla yaşanır. Bu mövzuyla əlaqəli ayələrdəki izahlar son dərəcə aydındır. Vəziyyət belə ikən Rəsulullahın (s.ə.s) sünnəsindən üz çevirmək lazım olduğu bir iddiayla ortaya çıxmaq sözün əsl mənasında Qurana müxalif fikirdir. İslam alimləri Peyğəmbərimizin (s.ə.s) sünnəsini Nuhun (ə.s.) gəmisinə oxşadaraq *"Kim ona minərsə xilas olar, kim minməzsə boğular"*[19] – demişdir.

19 Suyuti, *Miftahul Cənnə*, s. 53-54.

## II. Hz. PEYĞƏMBƏR DÖVRÜNDƏ HƏDİS ELMİ

İslam dini təbliğ edilməyə başladıqda müsəlmanlar Hz. Peyğəmbərdən öyrəndikləri dini həm mühafizə etməyə, həm də həyatlarında tətbiq etməyə başladılar. Hz. Peyğəmbər (s.ə.s) bütün sahələrdə olduğu kimi elm sahəsində də əshabına rəhbərlik edərək onlara müəllimlik etmişdir.



Bu bir həqiqətdir ki, Hz. Muhamməd özünə verilən risalət vəzifəsini həyatının hər mərhələsində əmr edildiyi kimi lazımınca yerinə yetirmişdir. İslami prinsiplər ən açıq şəkildə onun dövründə ortaya qoyulmuş, insanların ictimai həyatını tənzim edən bu yeni nizam hər cəhətdən, Onun sağlığında həyata keçirilmişdir. Müəllimi Hz. Muhamməd, proqramı Quran və Sünnə, tələbəsi də Səhabə olan bu yeni tərbiyə sistemi, qısa müddətdə müsbət nəticələr vermişdir. Heç şübhəsiz, bu vəziyyət o dövrə aid məlumatların cəmiyyətdə yayılması və qorunması ilə mümkün olmuşdur. Belə olmasaydı onun qorunub sonrakı nəsillərə çatdırılması çətinləşər, hətta imkansız olardı. Halbuki, Onun yaşadığı həyat bütün incəliklərinə qədər müəyyənləşdirilib qorunmuşdur.

Hz. Peyğəmbər dövründə elm öyrənmək üçün vasitələr məhdud olduğuna görə məlumatlar əzbərlənərək qorunurdu. Məhz buna görə ərəb cəmiyyətinin önəm verdiyi hadisə və şeirlər əzbərlənərək sonrakı nəsillərə çatdırılırdı. Bu mənada hədislərin də cəmiyyətə çatdırlıması önəmli məsələlərdən biri idi. Odur ki, onların (hədislərin) cəmiyyətə çatdırılma metodları önəm kəsb edir. Bu xüsuslara qısa nəzər salaq:

*Allahın rızası, ana və atanın rızasındadır. Allahın qəzəbi də ana-atanın qəzəbindədir.*

(Tirmizi, Birr, 3)

### A. HƏDİSLƏRİN CƏMİYYƏTƏ ÇATDIRILMASI

Bu mərhələdə Peyğəmbər (s.ə.s) dövrünün elmi və mədəni vəziyyətini əks edən və eyni zamanda bu zəngin elm mirasının yəni hədislərin cəmiyyətə çatmasını təmin edən müxtəlif amillərdən söz etmək mümkündür.

#### 1. Hz. Peyğəmbərin elm və hədis öyrənməyə təşviq etməsi

İlk əmri **"Oxu!"**[20] olan, son və mükəmməl din İslam elmə və elm öyrənməyə çox əhəmiyyət vermişdir. Allah-Təala Qurani-Kərimdəki müxtəlif ayələrində elmin öyrənilməsini əmr etmiş,[21] bilinməyən xüsusların bilənlərdən soruşulmasını istəmiş,[22] bilənlə bilməyənin, alimlə cahilin bir olmadığını göstərərək,[23] elm adamının dəyərini ucaltmışdır.[24]

20 Ələq, 96/1.
21 ***"...De ki: Ya Rəbb! Mənim üçün elmi artır"*** (Taha, 20/114)
22 ***"...Əgər siz bilməyən kimsələr isəniz, o təqdirdə bilən şəxslərdən soruşun"*** (Ənbiya, 21/7)
23 ***"...De ki; heç bilənlərlə bilməyənlər bir olarmı?"*** (Zümər, 39/9)
24 ***"Fəqət onlardan elmdə mütəxəssis olanlar və sənə endirilmiş olana və səndən əvvəl endirilmiş olana inanan, namazı dos-doğru qılan və zəkatı verən və Allaha və axirət gününə iman edən möminlər var ki; onlara əlbəttə böyük bir mükafat verəcəyik"*** (Nisa, 4/162)

Əshabına elm öyrədən, bildiklərini özü şəxsən yaşayan və bu yaşayışı ilə örnək olan Rəsulullah (s.ə.s), səhabələrini də elm öyrətməyə təşviq edirdi. *"Alimlər Peyğəmbərlərin mirascılarıdır."*[25]

*Hər kim elm axtarmaq məqsədiylə bir yola çıxarsa, Allah, ona cənnətə çatan yolu asanlaşdırar."*[26] kimi hədislər Onun elmə nə qədər əhəmiyyət verdiyini göstərir.

**MÜZAKİRƏ EDIN.**

Aşağıdakı hədisi də nəzərə alaraq Peyğəmbərin (s.ə.s) elmə verdiyi əhəmiyyəti yoldaşlarınızla müzakirə edin.

*"Allah, kimin xeyrini murad edərsə, onu dində fəqih (anlayış sahibi) edər."* (Buxari, Elm 13.)

Hz. Peyğəmbər əleyhissalam hədislərin rəvayət edilməsini sadəcə səhabədən istəmir, onlardan sonra gələnlərin də bu hədisləri öyrənərək başqalarına öyrətmələrini xüsusilə istəyirdi.

### 2. Səhabənin hədis öyrənmə və rəvayət etmə əzmi

Hz. Peyğəmbərin (s.ə.s) ətrafında olan səhabələr, onun hədislərini öyrənə bilmək, etdiyi hərəkətləri görə bilmək üçün böyük səy göstərirdilər. Peyğəmbərimizdən öyrəndiklərini dərhal yoldaşlarına rəvayət edirdilər. Əbu Zərr əl-Giffarinin bu sözü, səhabənin bu mövzudakı əzm və səyini ifadə edir: *"Qılıncı boynuma qoysanız, mən də qılınc məni kəsmədən əvvəl Rəsulullahdan eşitdiyim bir sözü təbliğ və rəvayət etməyə vaxt tapacağımı bilsəm, bunu mütləq edərəm."*[27]

*Asanlaşdırın, çətinləşdirməyin. Müjdələyin, nifrət etdirməyin*
(Buxari, Elm, 12; Müslüm Cihad, 6)

### 3. Hz. Peyğəmbərin Ailəsi

Hədislərin topluma yayılıb, digər insanlar tərəfindən öyrənilməsində Rəsulullah (s.ə.s) xanımlarının önəmli xidmətləri olmuşdur. Xüsusilə Hz. Aişə bu mövzuda öndə gəlir. Evlilik həyatına, qadınların xüsusi hallarına aid məlumatlar, Peyğəmbərimizin xanımları tərəfindən digər qadınlara çatdırılmışdır. Həmçinin çox hədis rəvayət edən yeddi səhabədən biri də məhz Aişə anamızdır.

### 4. Hz. Peyğəmbərin Elçiləri

Peyğəmbərimiz, yeni müsəlman olmuş cəmiyyətlərə Qurani-Kərimi və İslamın əsaslarını öyrətmək üçün bəzi səhabələri vəzifələndirirdi. Muaz ibn Cəbəl və Əbu Musa əl-Əşarinin də içərisində olduğu elçilər[28] qrupu getdikləri yerlərdə İslamı təbliğ etmək və öyrətmək vəzifəsini davam etdirməklə yanaşı hədisləri də xalqa çatdırmışlar.



Hz. Peyğəmbərin təbliğ məqsədli göndərdiyi məktublarından bir nümunə

25 Buxari, Elm, 10.
26 Buxari, Elm, 10 ; Tirmizi, elm, 19 ; İbn Macə, Müqəddimə, 17.
27 Buxari, Elm, 10.
28 Müslim, İman, 19

**5. Xaricdən gələn elçilər**

Müsəlman olmaq və İslam dinini öyrənmək üçün və ya Peyğəmbərimizin dəvətinə tabe olaraq bəzi yerlərdən Mədinəyə müxtəlif heyətlər gəlir, Peyğəmbərimiz əleyhissalam və səhabə ilə görüşür, onlardan bir çox şey öyrənirdilər. Bu kəslər, ölkələrinə qayıdarkən oradakı digər insanlara da öyrəndiklərini çatdırırdılar.




*Bir müsəlmanın əkdiyi ağacdan yaxud əkindən quş, insan və ya heyvanların yemələri o müsəlman üçün bir sədəqədir*

(Buxari, Ədəb, 27, Müslüm, Musakat, 7, 10)

**B. Hz. PEYĞƏMBƏRİN DÖVRÜNDƏ HƏDİS ÖYRƏNMƏ METODLARI**

İlk zamanlarda Hz. Peyğəmbər təlim üçün müəyyən bir vaxt ayırmamışdır. O həm ev əhlinin həm də digər müsəlmanların lideri və müəllimi idi. Evdə, küçədə, məsciddə öyrənmək ehtiyacı hiss edən hərkəs ona yaxınlaşır, soruşur və oyrənirdi. Hz. Peyğəmbərin təlim (öyrətmə) metodlarını belə sıralaya bilərik:

**1. Hadisələrə görə danışması**

Hz. Peyğəmbər (s.ə.s) hədislərini ümumiyyətlə bir hadisəyə bağlı olaraq söyləmiş və beləcə sözlərinin daha tez başa düşülməsini və oxşar hadisələrin təkrarında daha rahat xatırlanmasını təmin etmişdir. Məsələn; Bir adam Rəsulullaha gələrək məhəllə imamının namazı uzun qıldırdığından və bu səbəblə özünün sübh namazına getmədiyini şikayət etmiş, buna bağlı olaraq Hz. Peyğəmbər camaata dönüb belə demişdir: *"Ey camaat! Həqiqətən içinizdə nifrət etdirənlər var. Bundan sonra kim camaata imam olarsa namazı xəfif (qısa) qıldırsın. Çünki arxasında yaşlı və zəiflər və işi olanlar da var"*.[29]

29 Buxari, Elm, 28; Müslim, Salat, 182.

### 2. Sual soruşaraq mövzuya diqqət cəlb etməsi

Hz. Peyğəmbər müsəlmanların diqqətini cəlb etmək və maraqlarını artırmaq üçün onlara suallar soruşardı. Bu suallar təsadüfi suallar deyil, əksinə həmsöhbəti xəbərdar edən, onların zehinlərini öyrənməyə hazırlayan suallar idi.

Məsələn, bir dəfə Hz. Peyğəmbər (s.ə.s) ətrafındakılara: *"Sizə nafilə orucdan, namazdan və sədəqədən daha üstün bir ibadətin nə olduğunu söyləyimmi?*"-deyə soruşdu. Onlar: *"Bəli ey Allahın Rəsulu, de!"*-dedilər. Bunun üzərinə Rəsulullah: *"Araları pozulmuş (küsülü) iki şəxsi barışdırmaqdır"* [30] buyurdu.

### 3. Suallara cavab verməsi

Müsəlmanlar öyrənmək istədiklərini Hz. Peyğəmbərdən soruşardılar. Hz. Peyğəmbər də bu suallara cavab verər və bu sözlərin daha yaxşı yaddaşlarında həkk olmasını təmin edərdi.

Məsələn Sufyan ibn Abdullah: " Ey Allahın Rəsulu! İslam haqqında mənə elə bir söz söyləki, onu səndən başqa birisinə soruşma ehtiyacı hiss etməyim"-dedi. Bunun üzərinə Allah Elçisi belə dedi: *"Allaha iman etdim de və doğru ol!"*[31]

### 4. Yavaş-yavaş və təkrarlayaraq danışması

Hz. Peyğəmbər sözlərinin yaxşı anlaşılması və rahat öyrənilməsi üçün kəlmələri bir-bir, aramla söyləyərdi. Hz.Aişənin rəvayətinə görə, Hz. Peyğəmbər elə açıq danışırdı ki, hər kim onun kəlmələrini saymaq istəsəydi saya bilərdi.[32]

Ənəs ibn Malik belə rəvayət edir; "Hz. Peyğəmbər bir söz söylədiyi zaman yaxşıca başa düşsünlər deyə üç dəfə təkrar edərdi".[33]

*Bir-birinizə nifrət etməyin, bir-birinizə həsəd etməyin, bir-birinizə arxa çevirməyin; Bizi aldadan bizdən deyildir*

(Müslüm, İman, 164)

### 5. Ehtiyac qədər danışması



Abdullah ibn Məsud bir gün Hz. Peyğəmbərə: "Ey Allahın elçisi! Allahın ən çox xoşuna gələn əməl hansıdır?"-diyə soruşmuşdu. Hz. Peyğəmbər: *"Vaxtında qılınan namazdır"*-diyə cavab vermişdir.

Sonra hansıdır?

*Ana – ataya yaxşılıq etmək*

Sonra hansıdır?

*Allah yolunda savaşmaq.*

İbn Məsud sözlərinə belə davam edir: "Əgər soruşmağa davam etsəydim daha çox şey söyləyəcəkdi."[34]

Bu misalda görüldüyü kimi Hz. Peyğəmbər qarşısındakının ehtiyacı qədər məlumat vermişdir.

---

30 Əbu Davud, Ədəb, 50.
31 Müslim, İman, 62 ; Tirmizi, Zöhd, 60.
32 Buxari, Mənaqib, 23; Müslim, Zöhd, 63.
33 Buxari, Elm, 30.
34 Buxari, Məvaqit, 5; Ədəb, 1.

#### 6. Təlimi asanlaşdırması

Bir dəfə Nəcid xalqindan bir adam Rasulullahın hüzuruna gəldi və ona İslamın nə olduğunu soruşdu. Allahın elçisi:

-*"Bir gün bir gecədə beş vaxt namaz qılmaqdır*"- dedi:

-Bu namazlardan başqa edəcəyim bir şey varmı?

-"*Xeyr, nafilə olaraq qılmaq istəyirsənsə o başqa. Bir də ramazan orucu var."*

-Üzərimdə bundan basqası da olacaqmı ?

-"*Xeyr, ama istəyərsənsə nafilə oruc tuta bilərsən.Yalniz bir də zəkat var."*

-Ediləcək basqa bir şey varmı?

- "*Xeyir, nafilə olaraq sədəqə verə bilərsən.*"

Bunun üzərinə nəcidli qalxıb gedərkən, "Vallahi bundan nə çox, nə də əksik bir şey etməyəcəm"-dedi. Hz. Peyğəmbər də: *"Əgər doğru söyləyirsə cənnəti qazandı"*- buyurdu.[35]

Bu nümunədə də görüldüyü kimi Hz. Peyğəmbər İslamı yeni öyrənən şəxsə son dərəcə rahatlıq göstərmişdir. Dinin bütün prinsiplərini sayaraq onu qorxutmamışdır. Müsəlmanlara da belə etməyi tövsiyə etmişdir. Bu haqda belə demişdir: *"Siz asanlaşdırıcı olaraq göndərildiniz. Çətinləşdirici olaraq deyil,"*[36] *"Asanlaşdırın çətinləşdirməyin, sevdirin nifrət etdirməyin"*.[37]

#### 7. Bezdirməməyə diqqət etməsi

Təlim tərbiyənin əsas prinsiplərindən biri də şübhəsiz muxatabı bezdirməməkdir. Hz. Peyğəmbər də bu xüsusa diqqət yetirərək hər gördüyü insana hər anda tövsiyələr etmək əvəzinə müsəlmanlara həftənin müəyyən günlərində məlumat verməyi uyğun görmüşdür.



*Dul və kasıblara kömək edən şəxs Allah yolunda cihad edən və ya gecələrini (nafilə) ibadətlə keçirən, gündüzləri (nafilə) oruc tutan şəxslər kimidir*

(Buxari, Nəfəqə,1; Müslüm, Zöhd, 41; Tirmizi, Birr, 44; Nəsai, Zəkat, 78)

35 Buxari, İman, 34; Müslim, İman, 8-9.
36 Buxari, Ədəb, 80; Əbu Davud, Təharət, 136.
37 Buxari, Elm, 11; Müslim, İman, 31.



### YADDA SAXLA

Ən son vəfat edən səhabə Əbut-Tufeyl əl-Leysi. Onun vəfat tarixi hicrətin 110-cu ilidir. Peyğəmbərimiz əleyhissalam da vəfatından bir ay əvvəl: *"Yüz il sonra bu gün, yer üzündə heç bir canlı kəs sağ qalmayacaqdır"(Buxari, Elm 41)* buyuraraq ən son vəfat edən səhabənin 110 cu ildə olacağına diqqət çəkmişdir. Hz. Peyğəmbərin h. 11 ildə vəfat etdiyini nəzərə alsaq bu tarix hicrətin 110- cu ilinə təsadüf edir.

*Ən məqbul yaxşılıq ata dostu ilə əlaqələri davam etdirməkdir"*

(Müslim, Birr 11)

### QEYD EDİN

Əshabı-kiramın həyatlarından bəhs edən əsərlərin ən məşhurları bunlardır;

1. İbn Abdilbərr əl-Qurtubinin (vəfatı 463/1071) 3500 səhabidən bəhs edən *əl-istiab fi marifətil-əshab;*

2. İbnül-Əsir əl-Cəzərinin (vəfatı 630/1233) təqribən 8000 səhabiyi tanıdan *Üsdül-ğabə fi marifətis-səhabə;*

3. İbn Həcər əl-Əsqalani (vəfatı 852/1448) 12000 yaxın səhabənin tərcüməyi halını əhatə edən *əl-İsabə fi təmyizis-səhabə.*

## III. SƏHABƏ DÖVRÜNDƏ HƏDİS ELMİ

Allahdan vəhy alan Hz. Peyğəmbər aldığı bu əmrləri öz həyatında tədbiq edərək ətrafındakı insanlara çatdırmışdır. Hz. Peyğəmbərə inanan və ondan öyrəndiklərini daha sonrakı nəsillərə çatdıran bu insanlara ümumi olaraq səhabə deyilmişdir.

### A. SƏHABƏNİN TƏRİFİ

Səhabə və ya əshab, Hz. Peyğəmbərin müasirlərinə verilən addır. **Müsəlman olaraq Rəsuli Əkrəmi görən və bu imanla yaşayıb vəfat edən şəxslərə səhabə deyilir**. Sağını solunu ayıra bilən və ya sözü başa düşüb cavab verə bilən uşaqlar ilə korlar da Hz. Peyğəmbəri görmək şərtiylə- sahabi olaraq qəbul edilir. Bir kimsənin səhabə olduğu özünün etiraf etməsi, səhabə və ya tabeun tərəfindən şahidlik edilməsi və yaxud da hər kəs tərəfindən tanınan biri olması ilə bilinir.

### B. SƏHABƏNİN SAYI

Səhabilərin sayını dəqiq olaraq söyləmək mümkün deyildir. Sayıları 40000 ilə 120000 arasında ifadə edilir. Əshabın biyoqrafiyalarına həsr edilmiş əsərlərin ən həcmlisində 12000-ə yaxın səhabinin həyatından söz edilir.

### C. SƏHABƏNİN HƏDİS ÖYRƏNMƏ METODLARI

Yuxarıda da qeyd etdiyimiz kimi Hz. Peyğəmbər, hədislərin rahat bir şəkildə öyrənilməsi üçün müəyyən metodlardan istifadə etmişdir. Bu metodlardan əlavə səhabə də Hz. Peyğəmbərdən eşitdikləri hədisləri çətinlik çəkmədən mühafizə etmək üçün müəyyən yollaradan istifadə etmişdirlər. Bu yollardan ən əsasları aşağıdakılardır:

#### 1. Müzakirə

İlk dövrlərdə hədislərin yazılması Qurani-Kərimə qarışar narahatçılığı ilə Hz. Peyğəmbər (s.ə.s) tərəfindən qadağan edildiyi üçün[38], hədisləri öyrənib zehnlərə yerləşdirmək və beləliklə mühafizəsini təmin etmək, ancaq müzakirə ilə mümkün idi. Bu mövzuda Ənəs ibn Malik (ra) belə deyir: *"Biz, Rəsulullahın*

38 Əhməd ibn Hənbəl, Müsnəd, III/ 12, 21.

*(s.ə.s) yanında olub, hədisləri Ondan dinləyərdik. Oradan ayrıldıqdan sonra, eşitdiyimiz hədisləri əzbərləyincəyə qədər aramızda müzakirə edərdik.* [39]



**2. Yazma**

Hz. Peyğəmbərin (s.ə.s) hədislərin yazılmasına icazə verməsindən sonra səhabələr, əzbərlədikləri hədisləri yazıya köçürmüşdürlər. Ənəs ibn Malik, Abdullah ibn Əmr ibn Əl-As, Abdullah ibn Ömər, Zeyd ibn Sabit, Hz. Əli hədis yazan səhabələrdən beziləridir.

**3. Elm Məclisləri**

Hz. Peyğəmbər (s.ə.s), məsciddə oturduğu zaman səhabələr onun ətrafında halqa kimi oturar və Rəsulullahın (s.ə.s) söylədiyi hədisləri təkrar edərək əzbərləyərdilər. Bu elm məclisləri üçün müəyyən bir gün və ya zaman təyin edilməsə də ümumiyyətlə namazlardan sonra edilərdi. Rəsulullah (s.ə.s), əshabına Quran, sünnə, axirət və s mövzularla əlaqəli dərslər verər, səhabələrin suallarını cavablandırardı.[40]

**4. Sual Soruşmaq**

Səhabə, İslamın hökmlərini öyrənmək, çətinlik çəkdikləri məsələlərdə həqiqəti, İslamın qaynağı olan Hz. Peyğəmbərdən (s.ə.s)öyrənə bilmək üçün Rəsulullaha (s.ə.s) suallar soruşur, onun verdiyi hökm və etdiyi izahatları ehtiva edən hədisləri dərhal öyrənirdilər.




*Ey Allahın qulları qardaş olun. Bir müsəlmana üç gündən artıq (din) qardaşı ilə küsülü qalması halal olmaz.*

(Buxari, Ədəb, 57 -58)

---

39 Əhməd ibn Hənbəl, Müsnəd, X/ 21-22.
40 Heysəmi, *Məcmauz-Zəvaid*, I,159.

**5. Təqib**

Səhabələrin bir qismi davamlı olaraq Hz. Peyğəmbərin yanında olur, ondan hədis öyrənirdilər. Bu səhabələr, bəzən özləri bir dərs halqası qurub və Rəsulullahdan (s.ə.s) öyrəndiklərini başqalarına çatdırardılar. Məsələn; bunların ən məşhuru Rəsulullahdan ən çox hədis rəvayət etmiş olan Əbu Hüreyrə (r.a), cümə namazından öncə, Abdullah ibn Məsud isə çərşənbə günləri hədis öyrənərdi. Hz. Peyğəmbərin (s.ə.s) yanında həmişə olmayanlar isə, bəzən gəlib günlərlə qalır, bir qismi də növbələşərək hədis öyrənirdilər, sonra da getdikləri yerlərdə təbliğ edirdilər.

## D. SƏHABƏNİN HƏDİS RƏVAYƏTİ

Əshabın müxtəlif yollarla əldə etdikləri hədisləri başqalarına öyrətmək üçün də böyük səy göstərmişdirlər.

### 1. Hədis Rəvayətində Səhabənin Əhəmiyyəti

Səhabələr ilk nəsil olduqları üçün hədis rəvayətində mühüm yerə sahibdirlər. Hz. Peyğəmbəri görən, Onun sözlərini eşidən, davranışlarını yaxından tanımaq şərəfinə sahib olanlar onlardır. Din sahəsində bildiklərimizin hamısını onlara borcluyuq. Onlar olmasaydılar nə Quran bizə qədər çatardı, nə də dinin tətbiqatı haqqında bu qədər biliklərə sahib ola bilərdik. Bu günə gəlib çatan bütün hədislər onlar vasitəsilə rəvayət olunub bizə çatmışdır. Onlardan ən az birinin imzası olmayan hədis, hədis alimləri tərəfindən səhih, sağlam hədis kimi qəbul edilmir. Onların bu əhəmiyyətinə bələd olan alimlər onlara böyük əhəmiyyət vermişdir. Şəxsi bacarıqları nə olursa olsun onların hamısını hədis rəvayətində (adil) sağlam, etibarlı qəbul etmişlər. Çünki səhabələr hədis rəvayət etməyi mühüm bir vəzifə olaraq qəbul etmişlər və bu mövzuda çox həssas və dəqiq hərəkət etmişlər.

*Heç bir valideyn övladına, gözəl tərbiyədən daha qiymətli bir hədiyyə verə bilməz.*
(Tirmizi, Birr, 33)




### 2. Səhabənin Hədis Rəvayətinə Bağlılıqları

Səhabələr Hz. Peyğəmbərdən öyrəndikləri hədisləri ən çətin şərtlərdə belə başqalarına nəql etmə işini sürdürmüş və bu mövzuda heç bir fədakarlıqdan boyun qaçırmamışlar.

Əbu Zərr əl-Giffari: *"Boynumu vurmaq üçün başımda qılıncla gözləsəniz və mən də bilsəm ki qılınc məni kəsmədən əvvəl Rəsulullahdan eşitdiyim sözü rəvayət edə biləcəm, mütləq bunu edərdim"* [41] demişdi.

Əbud-Dərda son nəfəsində belə yanındakıların köməyi ilə yatağında oturaraq Hz. Peyğəmbərin namazla əlaqəli bir hədisini rəvayət etmişdir.[42]

Muaz ibn Cəbəlin də Allahdan başqa ilah olmadığına və Muhamməadin onun elçisi olduğuna şəhadət edənin Cəhənnəmə girməyəcəyinə dair hədisi, Hz. Peyğəmbərin "*bunu heç kimə söyləmə, ona güvənib ibadətlərində laqeyid-*

41 Buxari, Elm, 10.
42 Əhməd ibn Hənbəl, Müsnəd, VI/ 443.



*lik göstərərlər"* -deyə xəbərdarlıq etməsinə baxmayaraq, vəfat edəcəyi zaman, üzərimdə məsuliyyət qalar düşüncəsi ilə, ətrafındakılara rəvayət etməsi, onun hədis rəvayətinə olan bağlılığını göstərir.[43]

Nəticə olaraq deyə bilərik ki, səhabə hədisləri öyrənib təbliğ etmək üçün əllərindən gələn bütün fəaliyyətləri göstərmişlər. Bu gün əlimizdə mövcud olan hədis ədəbiyyatı onların səylərinin məhsuludur.

### 3. Səhabənin Hədis Rəvayətində Ehtiyatlı Davranması

Səhabə, bir yandan başqalarına az hədis rəvayət etməyi tövsiyə etmiş və özləri də əllərindən gəldiyi qədər az rəvayət etməyə çalışmışlar. Bundan başqa, hədis rəvayət edənlər üçün də ehtiyatı əldən verməmişlər. Hədis rəvayət edənin hafizə və zəbtində şüphə olmadığından əmin olsalar, onun hədisini qəbul etmiş, başqa bir dəlil və ya şahid tələb etməmişlər. İndi bu hadisəni aydınlaşdıran bəzi rəvayətləri nəql edək;

Hz.Əbu Bəkr xəbərlərin qəbulu mövzusunda ehtiyatlı davrananların ilkidir. İbn Şihabın nəql etdiyinə görə, bir nənə özünə nəvəsindən miras ala bilib bilməməsini öyrənmək üçün Hz.Əbu Bəkrin yanına gəlmişdi. Əbu Bəkr (ra) də: *"Allahın kitabında bunun haqqında bir şey yoxdu. Hz. Peyğəmbərin sözlərində də səninlə əlaqəli bir şey bilmirəm"*-dedi. Sonra çevrilib yanındakılara soruşdu. Bunu eşidən Muğirə ayağa qalxdı və: *"Hz. Peyğəmbər nənəyə altıda bir hissə verirdi"*-dedi. Əbu Bəkr ona: "Səni təsdiq edəcək kimsə varmı"-deyə soruşdu. Məhəmməd ibn Məsləmə də ona şahidlik edincə, xəlifə Əbu Bəkr (ra) nənə üçün bu hökmü tətbiq etdi.[44]

**BİLİRDİNİZMİ?**

Mindən çox hədis rəvayət edən səhabələrə muksirun deyilir. Bunlar 7 nəfərdir.

Mindən az hədis rəvayət edənlərə də muqillun deyilir.

Zəhəbi, möminlərin xəlifəsi Hz.Ömər üçün belə deməkdədir, *"Muhaddislər üçün hədis naqlində təhqiq cığırını açan Ömərdir. Çox vaxt bir şəxsin verdiyi xəbərdə tərəddüd edərsə onu qəbul etməz, araşdırardı."*[45] Əbu Səidin nəql etdiyinə görə Əbu Musa, Hz.Ömərin qapısına gəlib içəri girmək üçün icazə istəmiş, Hz. Ömər cavab verməyincə geri dönmüşdü. Bunun üzərinə Hz.Ömər onun arxasınca bir şəxs göndərdi və *"nə üçün döndün?"*-deyə soruşdu. O da: *" Rəsulullahın belə dediyini eşitdim. Sizdən biriniz üç dəfə salam verib cavab almazsa geri dönsün"*-deyincə, Hz.Ömər, *"bunun üçün bir şahid gətirməlisən, yoxsa mən sənə nə edəcəyimi bilirəm"*-demişdi. Əbu Musanın Əbu Səidi şahid göstərdikdən sonra Hz.Ömər belə demişdir: *"İnanın, mən səni yalanlamaq üçün*

*Hər insan oğlu xəta edər. Xəta edənlərin ən xeyirlisi isə tövbə edənlərdir.*

(Tirmizi, Qiyamə, 49; İbn Macə, Zöhd, 30)

43 Buxari, Elm, 49.
44 Zəhəbi, *Təzkirə,* I, 2.
45 Zəhəbi, e.a.ə. I, 6.

*deyil, sırf insanların Rəsulullah adına yalan uydurmaqlarından qorxduğum üçün belə etdim."*[46]

Hz.Əli də belə demişdir: *"Hz. Peyğəmbərdən özüm bir hədis eşidəndə, o hədisdən Allahın istədiyi qədər faydalanıram. Fəqət başqa biri Peyğəmbərdən bir hədis rəvayət edərsə ona and içdirirəm. And içərsə doğru dediyinə inanıram."*[47]

Möminlərin anası Hz.Aişə də Hz. Peyğəmbərin Merac gecəsində Rəbbini gördüyünü bildirən hədisini, **"Gözlər onu görməz, O, bütün gözləri görər"**[48] ayəsinin xarici mənasını diqqətə alaraq rədd etmiş və belə demişdir: *"Kim Muhamməddin Merac gecəsində Rəbbini gördüyünü söyləyərsə Allaha ən böyük iftira atmış olar."*[49]

Bütün bu rəvayətlər bizə səhabənin hədis nəqlində nə qədər ehtiyyatlı davrandıqlarını göstərməkdədir. Onlar həm ravini həm də onun nəql etdiyi hədisi sağlam elmi tənqid metodlarıyla dəyərləndirmişlər.

*İman gətirmədikcə cənnətə girə bilməzsiniz, bir birinizi sevmədikcə də (həqiqi mənada) iman gətirməzsiniz.*
(Müslüm, İman, 93; Tirmizi, Sifatü'l – Qiyamə 56)




### 4. Səhabənin Fərqli Sayda Hədis Rəvayət Etmələrinin Səbəbləri

Səhabənin hamısı Peyğəmbərdən hədis rəvayət etməmişdir. Həmçinin verilən rəqəmlərə görə bunlardan minə yaxınının ən çox iki hədis rəvayət etdiyi nəzərə alınarsa geriyə əsil hədis rəvayət edənlərin sayısı qalır ki, bu da üç yüzdür. Fəqət bu üç yüz nəfərdən ancaq yeddi nəfərin mindən, dörd nəfərin beş yüzdən və iyirmi yeddi nəfərin yüzdən artıq hədis rəvayət etdiklərini qəbul edəndə cəmi otuz səkkiz nəfərin həqiqətən bu işlə məşğul olduğu söylənə bilər. Halbuki daha əvvəl də qeyd etdiyimiz kimi Əshabın sayısı

**BİLİRDİNİZMİ?**
Ən çox hədis ehtiva edən əsər kimi qəbul edilən Baki ibn Məxlədin (vəfatı 276/889) Müsnədində sadəcə 1300 səhabə tərəfindən rəvayət edilən hədislər yer alır.

46 Buxari, Buyu, 9; Müslim, Ədəb, 35,36.
47 Zəhəbi, e.a.ə, I, 10.
48 Ənam, 6/103.
49 Buxari, Təfsir, 53.




120000-ə yaxın idi. Buradan da başa düşmək olar ki, hədis rəvayət edən səhabənin sayı ümumi saya nisbətən olduqca azdır.

Təbii ki, belə olmasının müəyyən səbəbləri vardır. Bunlardan bir qismi xüsusi səbəblərdir ki, bu səbəbləri ancaq səhabənin həyatını araşdırmaqla bilmək olar. Bir qismi də ümumi səbəblərdir.

## IV. TABEUN DÖVRÜNDƏ HƏDİS ELMİ

Hədisləri bizə nəql edən ikinci təbəqə Tabeun nəslidir. Bu dövrdə bütün islami elmlər xüsusiylə də hədis elmi sahəsində bir çox tərəqqiyə imza atılmış və gələcək elmi sahələr üçün elmi təməllər hazırlanmışdır.

### A. TABEUNUN TƏRİFİ

***Hz. Peyğəmbərin əshabından hərhansı biriylə, mömin olaraq görüşən, onunla danışıb elm təhsil edən və mömin olaraq vəfat edən şəxsə tabei*** deyilir. Cəmi “tabeun”-dur.

### B. TABEUNUN FƏZİLƏTİ

Müsəlmanlar içərisində əshabdan sonra ən üstün olan nəsil tabiun nəslidir. Hz. Peyğəmbərin tərbiyəsində böyüyən, yetişən və onunla görüşmək şərəfinə nail olan əshab, tabiun nəslinə müəllimlik etmiş, Hz. Peyğəmbərdən özlərinə keçən nuru və məlumatlar onlara nəql etmişlər.

Qurani-Kərimdə uca Allah: **“Dində hamını qabaqlamış ilk mühacirlərdən, ənsardan və xeyir əməllərdə onların ardınca gələnlərdən Allah razıdır və onlar da Ondan razıdırlar...**[50] **ayəsindəki “xeyir əməllərdə onların ardınca gələnlər”** (و الذين اتبعوهم باحسان) ifadəsi ilə tabiun nəslindən bəhs etmiş və onlardan razı olduğunu bildirmişdir.

Hz. Peyğəmbər (s.ə.s) da:

خَير أمَّتِي قَرْنِي ثُمَّ الَّذِينَ يَلوُنَهُم ثُمَّ الَّذِينَ يَلوُنَهُم

*“Ümmətimdən ən xeyirli nəsil mənim də içində olduğum nəsildir. Sonra onlardan sonra gələnlər, sonra da onlardan sonra gələnlərdir.”*[51] buyuraraq əshabından sonra ən xeyirli nəslin tabiun nəsli olduğuna işarə etmişdir. Tabeun nəsli hədis rəvayətində səhabə nəsli kimi tənqid xaricində tutulmamışdır. Onların dövründə müxtəlif siyasi böhranlar, etiqadi fərqliliklər baş verdiyi üçün və bunlardan hər hansı birisinin bu hərəkətlərə qatılma ehtimalı olduğu üçün, hər biri hədis alimləri tərəfindən tənqid ələyindən süzülmüşdür.

*İmanın yetmişdən çox dərəcəsi var. Onlardan ən üstünü "La ilahəilillah"-sözüdür, ən aşağı dərəcəsi isə, (insanları) narahat edən bir əşyanı yoldan götürməkdir. Həya da imandandır*

(Buxari, İman, 3; Müslüm, İman, 57-58)

50 Tövbə, 9/100.
51 Buxari, Şəhadət, 9; Tirmizi, Fitən, 45.

## C. TABEUNUN HƏDİS ELMİNƏ XİDMƏTLƏRİ



Bu nəsil, səhabə ilə görüşərək hədis topladıqları və müxtəlif növdə qruplaşdıqları, bu hədisləri müzakirə edərək həm öz aralarında həm də sonrakı nəslə çatdırmaq surətiylə hədislərin itməməsini təmin etdikləri üçün hədis tarixində mühüm dəyərə sahibdirlər.

Tabeun, səhabədən sonra, həyatlarını elm və mədəniyyət yoluna həsr etmiş ikinci nəsildir. **Təfsir, Hədis, Fiqh, Kəlam** kimi İslami elmlərin çoxunun onların dövründə ortaya çıxıb sistemləşməyə başlaması, onların elmə verdikləri əhəmiyyətin və bu barədə çox çalışdıqlarının sübutudur. Tabeun, hədis təhsilinə böyük əhəmiyyət vermiş, və bu yolda böyük nailiyyətlər əldə etmişdir.

Ələbəttə onlar da hədisləri toplayarkən bir çox məşəqqətlərlə üzləşmişdir. Ancaq bu məşəqqətlər onları elm öyrənməkdən usandırmamışdır. Bu fəaliyyətlər nəticəsində fərqli bölgələrə gedən səhabələri ziyarət edərək onlardan hədis almış, hədis ravilərini araşdırıb rəvayəti qəbul ediləcək səviyyədə olanları müəyyənləşdirmişlər.

*İnsan dostunun dinindədir. Ona görə də hər kəs kimlərlə dostluq etdiyinə diqqət yetirsin”.*

(Əbu Davud, Ədəb 16; Tirmizi, Zöhd 45)

Beləliklə hədislərin toplanması (tədvin) dövrü başlanmışdır. Əzbərləyərək və yazaraq davam etdikləri bu fəaliyyətlər hədislərin mühafizə edilməsinə və yayılmasına kömək etmişdir. Nəticəsə hədis kolleksiyaları ortaya çıxmışdır.

Onların bu çalışmaları yeni sistemin meydana gəlməsinə səbəb olmuşdur. Məhz isnad sistemi bu çalışmanın nəticəsində ərsəyə gəlmişdir.

Hədisləri tədvin etmək üçün elmi səyahətlər təşkil etmişdilər. Bu elmi səyahətlərə “Rihlə” deyilir.

## D. ELMİ SƏYAHƏTLƏR və SƏBƏBLƏRİ



“ər-Rihlə fi tələbil-Hədis” adı ilə şöhrət qazanan bu səyahətlər səhabələr arasında olduğu kimi, tabeun arasında da get-gedə artmış və hədis toplamağın üsullarından biri olmuşdur. Hədislə məşğul olan bir çox tabeun, ilk qaynaq olan, müxtəlif ölkələrə yayılan səhabələri bir-bir ziyarət edərək onlardan, Peyğəmbərimizdən (s.ə.s) eşidib rəvayət etdikləri hədisləri toplamağa başladılar. Səid ibn əl-Müsəyyəbin lazım olduğunda bir hədis üçün günlərlə yol getdiyini söyləməsi, Məsruq ibn əl-Əcdanın bir hərf üçün də olsa səyahət etməsini bildirməsi hədislərin toplanması və doğru olaraq müəyyənləşdirilməsi üçün sərf olunan əmək və diqqəti göstərən dəlillərdəndir.




Hədis toplamaq üçün edilən səyahətlər bir tərəfdən hədislərin daha geniş ölkələrə yayılmasını təmin etdiyi kimi, digər tərəfdən bir hədis mətninin müxtəlif rəvayət şəkillərinin də ortaya çıxmasına səbəb olmuşdur. Çünki bir hədisçi bəzən yaşadığı şəhərdə öz şeyxindən eşitdiyi bir hədisi bir başqa yerdə və başqa bir şeyxdən daha başqa bir şəkildə eşidə bilərdi. Bu isə bir tərəfdən hədisçilər arasında hədislə əlaqəli müzakirə qapısını açarkən, digər tərəfdən də "filankəs hədisi belə rəvayət etdi, filankəs də belə..." ifadəsinin təbii bir nəticəsi olaraq isnad fikrinin yerləşib inkişaf etməsində əsas amillərdən biri olmuşdur.

Elm tələb etmək üçün səyahət etmənin bir neçə səbəbi var. Bunlardan ən əhəmiyyətlilərini belə sıralaya bilərik:

1. Səhabə dövründə rihlə, bəzən səhabənin Hz. Peyğəmbərdən eşitmədiyi bir hədisi dinləmək məqsədi ilə edilirdi. Bəzən də, səhabinin bildiyi, ancaq yaşadığı şəhərdə bu hədisi özündən başqa heç kim bilmədiyi üçün, bu hədisi dəqiqləşdirmək üçün edilirdi.
2. Səhabənin müxtəlif bölgələrə yayılması səbəbiylə eyni səfərlər tabeun dövründə də davam etdi. Səhabənin hər biri nəbəvi mirasdan bir pay daşıdığı üçün onların elminə ehtiyac vardı. Bu səbəbə görə də özlərindən hədis almaq və ya möcvud hədisləri dəqiqləşdirmək üçün onların məskunlaşdıqları yerlərə səfərlər edilirdi.
3. Hədis uydurma hərəkətinin başlaması.
4. Ali sənəd axtarışı. Ali sənəd tələbi üçün də səfərlərə çıxılmışdır. İmam Əhmədin bildirdiyinə görə, "Ali sənəd tələbi, sələfdən qalan bir sünnədir."

*İnsanda bir ət parçası vardır. Əgər o sağlam olsa, bütün bədən sağlam olar; əgər o pozulsa, butun bədən pozular. Diqqətli olun! O, ürəkdir.*
(Buxari, İman, 39, Müslüm, Musakat, 107)

## V. ƏTBAUT-TABEİN DÖVRÜNDƏ HƏDİS ELMİ

Ətbaut tabein Hz. Peyğəmbərin hədislərini rəvayət edən üçüncü nəsli təşkil edir. Bunların dövrü hədis alma və nəql etmə üsullarının ən mükəmməl hala gəldiyi dövrdür.

### A. ƏTBAUT-TABEİNİN HƏDİS ELMİNƏ XİDMƏTLƏRİ

Bu dövrün Hədis elmi yönündən önəmini iki halda izah etmək olar:

Hədis elminin əsas qollarından biri olan Cərh və Tədil[52] bu dövrdə sistemləşmişdir. Bilindiyi kimi tabiun zamanında hədislərin müxtəlif şəkildə

52 Bir ravinin, günahkarlıq, yalançılıq və s. qüsurularına görə hədis mütəxəssisləri tərəfindən rəvayətinin rədd edilməsinə cərh deyilir. Tədil isə ravinin, rəvayətinin qəbul edilməsinə dair onu tanıdan sifətlərinin qeyd edilməsiylə təzkiyə edilməsi (ədalətli, güvənilən və möhkəm olduğunun göstərilməsi) deməkdir.

**QEYD EDİN.**

Ətbaut-tabeun dövründə hədis elmi sahəsində bunlar edilmişdir.

Hədis elmi, üsul və qaydaları ilə təşəkkül etmişdi

Tabeun dövründə toplanan hədislər fiqh bablarına görə təsnif edilmişdir.

rəvayət olunması, uydurma rəvayətlərin meydana çıxması, hədis elminin təşəkkül etməsinin əsasını qoymuşdur. Bununla bərabər cərh və tədil metodu ilə isnad üsulundan istifadə olunmağa başlanmışdır. Tabiunlar səhih Hədisləri doğru və nöqsansız bir şəkildə təsbit etmək və uydurma rəvayətləri ayırmaq üçün müxtəlif üsul və qaydalardan istifadə etmişlər. Təbəut-tabiun dövründə isə bu qaydalar inkişaf etmiş və ən mükəmməl şəklini almışdır. Artıq təbə-tabein mühəddisləri:

- Hədis təliminin üsul və qaydalarını,
- Hədis rəvayətinin əsaslarını,
- Ravilərin hallarını və bir ravinin şərt və vəsfləri,
- Hədislərin sağlamlıq dərəcələrini tam olaraq sistemli bir şəkildə bilirdilər. Ancaq hədis elmini təşkil edən bu xüsuslar, bu mərhələdə yazıya keçirilməmişdir.

*İnsanların Peyğəmbərlərdən öyrəndikləri sözlərdən biri də: "Utanmadıqdan sonra istədiyini et!"- sözüdür*

(Buxari, Ənbiya, 54; Əbu Davud, Ədəb, 6)

Hədislər, səhabə dövrünün sonu ilə tabeun dövrünün ilk illərində toplanmağa başlamış, tabiunun uzun və yorucu, ancaq dəqiq və səmimi çalışmaları nəticəsində bu dövrün sonlarına doğru tədvin (hədis toplama) işi böyük ölçüdə tamamlanmışdır. Toplanan hədislər yazıya keçirilsə belə sinifləndirilməmişdi.

Ətbut-tabiun mühəddisləri, toplanan hədisləri mövzularına görə təsnif edib, “müsənnəf” əsərlər meydana gətirmişlər. İmam Malikin Muvəttası bunun ən gözəl örnəyidir.



## BİRİNCİ FƏSİLƏ AİD SUALLAR

1. Hz. Peyğəmbərin bəşəri vəsfi ilə əlaqəli üç xüsusiyyət sayın
2. Hz. Peyğəmbərin peyğəmbərlik vəsfi ilə əlaqəli üç xüsusiyyət sayın
3. Hz. Peyğəmbərin bəşəri vəsfinə diqqət cəlb edilməsinin məqsədi nədir?
4. Hz. Peyğəmbərin "hökm qoyma səlahiyyəti (təşri)" nə məna ifadə edir?
5. Hz. Peyğəmbərə itaəti necə başa düşməliyik?
6. Səhabəni tanıma yolları hansılardır?
7. Tabeun dövründə hədis elminə verilən töhfələr nələrdir?

### Test Sualları

**1. Aşağıdakılardan hansı Hz. Muhammədin peyğəmbərlik vəsfinə aid bir xüsusiyyət deyil?**

a) Təbliğ
b) Ticarət
c) Təbyin (açıqlama)
d) Təşri (hökm qoyma)
e) Vəhy alma

**2. Aşağıdakılardan hansı Peyğəmbər (ə.s.) dövründə hədis öyrənmə metodlarından biri deyil?**

a) Əzbərləmə
b) Sual soruşma
c) Müzakirə
d) Yazma
e) Münaqişə

**3. Aşağıdakı hədis hədislərin cəmiyyətə çatdırılması baxımından nəyi ifadə edir?**

*"Bu vəsiyyətimi, burada olanlar, olmayanlara çatdırsın. Ola bilər ki, burada olan kimsə bunları daha yaxşı anlayan birinə çatdırmış olar.*

a) Hz. Peyğəmbərin ailəsi
b) Hz. Peyğəmbərin Təşviqi
c) Səhabənin elm sevgisi və hədis öyrənmə şövqü
d) Quranın elmə təşviqi
e) Ağıl və Zəka

**4. Mindən çox hədis rəvayət edən səhabələrə muqsirun deyilir. Buna əsasən aşağıdakılardan hansı səhabə muqsirun deyildir?**

a) Əbu Hüreyrə

b) Abdullah ibn Ömər

c) Hz. Aişə

d) Ənəs ibn Malik

e) Əbu Zərr əl-Ğifari

**5. Aşağıdakılardan hansı rihlə etmənin səbəblərindən deyildir?**

a) Hədis uydurma hərəkətlərinin başlaması

b) Ali sənəd axtarışı

c) Səhabənin müxtəlif bölgələrə yayılması

d) Hədislərin yazılmağa başlanması

**Boşluqları doldurun**

1. Hz. Peyğəmbər dövründə yazı ləvazimatları az olduğuna görə ............ əsaslanan sözlü ifadə şəklindən istifadə edilirdi.

2. ...............................ən hədis rəvayə edən səhabədir. Peyğəmbərimizdən ................. hədis rəvayət etmişdi.

3. Səhabə əsasən ailə ilə əlaqəli məlumatları Peyğəmbərimizin xanımlarından öyrənirdi. Xüsusilə ............................ bir çox səhabə və tabeuna müəllimlik etmiş və Hz. Peyğəmbərdən bir çox hədis rəvayət etmişdir.

4. Hz. Peyğəmbər ............. vəzifəsinə əsasən dində bəzi hökmlər qoyurdu.

## İKİNCİ FƏSİL

## HƏDİS ELMİNƏ AİD BƏZİ TERMİNLƏR

### HAZIRLIQ TAPŞIRIQLARI

1. Hz. Peyğəmbərin İslam dinindəki mövqeyini müəyyənləşdirməkdə hədis elmin mahiyyəti nədir? Araşdırın.
2. “Hədis” və “Sünnə” terminlərinin mənalarını öyrənin
3. İsnad və Sənəd terminlərini araşdıraraq bunlar arasındakı əlaqələri müzakirə edin.
4. Hədis elminin digər elmlərlə olan əlaqələri üzərində düşünün.
5. “ Ravi” və “Rəvayət” terminlərinin mənalarını öyrənin.

## I. HƏDİS ELMİNİN TƏŞƏKKÜLÜ

Qurani-Kərimi dünya və axirət xoşbəxtliyini qazanmaq yollarını göstərən hidayət rəhbəri olaraq göndərən Allah, onu açıqlama vəzifəsini də elçisi Hz. Muhammədə vermişdir.

Səhabə nəsli ilk zamandan bəri Hz. Peyğəmbərin hədislərinə və həyat tərzinə yüksək səviyyədə önəm vermiş, onları əzbərləmiş, həyatlarında tətbiq etmiş, onları olduğu kimi öyrənib başqalarına çatdırmaq üçün fövqaladə çalışmışlar.

Sünnəni öyrənmək üçün günlərini sərf edən ilk müsəlmanlar, daha sonralar yeni ölkələr fəth edildikdə, təbii olaraq bu səfər yeni müsəlmanların kitab və sünnəni öyrənmək arzularıyla qarşılaşdılar. İstər xəlifələr tərəfindən vəzifələndirilən valilər, istərsə də mücahid səhabələr, əsil vəzifələrinin təlim və təbliğ olduğu şüuruyla hərəkət edirdilər. Fateh səhabələrin əksəriyyəti, ayrı-ayrı bölgələrdə yerləşərək orada kitab və sünnə bilgisini yaymağa çalışdılar. Səhabələrin yorulmadan bu fövqaladə çalışmalarını görən tabiilər də bu çalışmaları sürdürmüşlər.

**MÜTALİƏ EDİN**

لَقَدْ كَانَ لَكُمْ فِي رَسُولِ اللَّهِ أُسْوَةٌ حَسَنَةٌ لِّمَن كَانَ يَرْجُو اللَّهَ وَالْيَوْمَ الْآخِرَ وَذَكَرَ اللَّهَ كَثِيراً

***"Həqiqətən, Allahın Rəsulu Allaha, qiyamət gününə ümid bəsləyənlər** (Allahdan, qiyamət günündən qorxanlar) **və Allahı çox zikr edənlər üçün gözəl örnəkdir!"*** (Əhzab, 33/21) Yuxarıdakı ayəni də diqqətə alaraq Hz. Peyğəmbərin nümunəviliyini mütaliə edin.

Digər tərəfdən ictimai, siyasi və etiqadi qarışıqlıqlar və Hz. Peyğəmbərə aid olmayan sözləri Ona aid etmə hərəkətləri bəzi qayda və elmi çalışmaların başlamasına səbəb oldu.

*İşçiyə, alnının təri qurumadan haqqını verin*

(İbn Macə, Əhkam, 65)

Hər elmi fəaliyyətin müəyyən əsaslar dairəsində tədbiq edilməsi nə qədər təbii isə, eyni şeylərin təkrarı da müəyyən qaydaların tapılmasını, yoxdursa qoyulmasını və tabe olunmasını tələb edir. Bir başqa ifadə ilə hər şeyin qayda qanunu var. Bu səbəblə yuxarda diqqət çəkdiyimiz elmi fəaliyyətlər də bəzi qaydaların müəyyənləşdirməsini lazımlı hala çevirmişdir. Bu qaydalar da daha sonra müstəqil kitabların mövzusu olan hədis üsulu prinsipləridir.

İstər sünnənin doğru olaraq nəql edilməsi, istərsə də bu mətinlərin sağlam şəkildə qorunub təlim tədrisinin və dəyərləndirməsinin edilməsi və bu

**QEYD EDİN.**

Hədis elmi "Rəvayətul-hədis" və "Dirayətül-hədis"-dən meydana gəlir. Rəvayətül-hədis elmi Hz. Peyğəmbərin söz, fel və təqrirləri ilə əlaqəli rəvayətləri müəyyənləşdirib sonrakı nəsillərə çatdırmaqla məşğul olur. Dirayətül-hədis elmi isə hədisin sənəd və mətninin incələyərək rəvayətin həqiqətən Peyğəmbərə (s.ə.s) aid olub-olmadığını müəyyənləşdirməklə məşğul olur. Dirayətul-hədis elminə Hədis üsulu da deyə bilərik.

**TAPIN**

Aşağıdakı ayələrdəki "Sünnə" kəlməsi hansı mənalar ifadə edir.

قَدْ خَلَتْ مِنْ قَبْلِكُمْ سُنَنٌ فَسِيرُوا فِي الْأَرْضِ فَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الْمُكَذِّبِينَ

Sizdən əvvəl bir çox vaqiələr (ibrətli əhvalatlar) olub keçmişdir. İndi yer üzünü dolaşıb haqqı təkzib edənlərin aqibətinin necə olduğunu görün! (Ali İmran, 3/ 137)

اِسْتِكْبَاراً فِي الْأَرْضِ وَمَكْرَ السَّيِّئِ وَلَا يَحِيقُ الْمَكْرُ السَّيِّئُ اِلَّا بِاَهْلِهِ فَهَلْ يَنْظُرُونَ اِلَّا سُنَّتَ الْاَوَّلِينَ فَلَنْ تَجِدَ لِسُنَّتِ اللّٰهِ تَبْدِيلاً وَلَنْ تَجِدَ لِسُنَّتِ اللّٰهِ تَحْوِيلاً

Yer üzündə təkəbbür göstərmələri və pis əməlləri ucbatından idi. Pis əməl ancaq onun öz sahibinin başında çatlayar. Məgər onlar Allahın adəti (qayda-qanunu) üzrə əvvəlkilərin düçar olduqları müsibətlərimi gözləyirlər? (ya Peyğəmbər!) Sən Allahın qoyduğu qayda-qanunda heç bir dəyişiklik tapmazsan! (Fatir, 35/ 43)

*Kim pis və çirkin bir iş görsə, onu əli ilə düzəltsin; əgər buna gücü çatmırsa, dili ilə düzəltsin. Buna da gücü çatmazsa, qəlbi ilə qarşı çıxsın. Bu isə imanın en zəif dərəcəsidir.*

(Müslüm, İman, 78; Əbu Davud, Salat, 248.)

dəyərləndirməyə kömək edəcək hər cür incələmə və fəaliyyətin başladılması, etiraf etmək lazımdır ki, əshab nəslinə aid bir şərəfdir. Səhabələr rəvayətül hədis elmini qurduqları kimi rəvayət qaydalarını da qoyaraq dirayətül hədis elminin bünövrəsini qoymuşlar.

Müsəlmanlardan əvvəl heç bir millət xəbər nəql edən ravilərin etibarlılıq vəziyyətlərini müəyyənləşdirmək üçün müəyyən qaydalar qoymağı düşünməmişdir. Hədislər və rəvayətlər sadəcə nəql olunmuşdur. Nadir olaraq bir-iki ravidən ibarət sənəd zikr edilmişdir. Buna görə də hədis nəql edənlərin şəxsi vəziyyətlərinin araşdırılması və mütləq sənədin zikr edilməsini əsas alan hədis üsulu elmi, müsəlmanlara aid xüsusiyyətdir.

"Sənəd və mətinin vəziyyətlərini anlamağa imkan verən bəzi qaydalar elmi" mənasına gələn Hədis Üsulu, daha ilk günlərdə müsəlmanların tapıb inkişaf etdirdikləri elmi nizamdır. Mövzusu da rədd və qəbul yönündən sənəd və mətindir.

Hədis elminin məqsədi Hz. Peyğəmbərin söz, fel və təqrirlərini eyni zamanda əxlaqi keyfiyyətlərini müəyyənləşdirib sonrakı nəsillərə çatdırmaqdır. Hədis elmi Hz. Peyğəmbəri nümunə alınması sahəsində çox əhəmiyyətli xidmətlər təqdim edir.

## II. HƏDİS ELMİNƏ AİD BƏZİ TERMİNLƏR

### A. SÜNNƏ

Sünnə, lüğətdə yaxşı və ya pis olsun *təriq* (yol) və *sirə müstəmirrə* (davamlı gediş) mənasına gələn kəlmədir. Termin olaraq isə, Hz. Peyğəmbərin həyatında izlədiyi yol, hərəkət tərzləri və yaşayış hallarıdır.

Hədisi-şəriflərdə ***"Sünnə"*** kəlməsinin fərqli istifadə şəkilləri qarşımıza çıxmaqdadır. Bütün bu mətinlərdəki ortaq nöqtə, Sünnənin; ***"yol, cığır, tətbiqat"*** mənasıdır.

*"... Məndən sonra çətin ixtilaflarla qarşılaşacaqsınız. Belə halda, sizə, mənim Sünnəmə və doğru yolu göstərən Raşidi-xəlifələrin sünnəsinə sarılmağınızı tövsiyə edirəm..."* hədisində, Sünnə ifadəsi, ***"doğru yol, nümunə alınacaq hərəkət"*** mənasında istifadə edilmişdir.

Yaxşı və ya pis cığır açma, arxadan gələcəklər üçün *adət* ola biləcək bir hərəkət etmə, mənasını ifadə edən bu hədis də olduqca məşhurdur:

*"Kim İslamda yaxşı cığır açarsa* (من سن سنة حسنة) *ona, həm onun savabı, həmdə qiyamətə qədər onu işləyənlərin savabı vardır. Kim də, pis bir adət çıxararsa* (من سن سنة سيئة) *ona da, həm onun, həm də qiyamətə qədər onu işləyənin günahı yazılar."*[53] Fərqli təriqlərlə gələn bu hədis mətinində ifadə edilən ***"Sünnə"*** ifadəsindən məqsəd, ***"bidət və dələlət"*** terminlərinin ziddi olduğu görülür.[54]

Sünnənin termin mənasına örnək olaraq Hz. Peyğəmbərin *"Kim mənim Sünnəmdən üz döndərərsə, məndən deyildir"*[55] hədisini göstərə bilərik.

Sünnə Allah Rəsulunun dünya görüşüdür. Yəni sünnə, Allahın kitabının Hz. Peyğəmbər tərəfindən edilən hərtərəfli şərhidir. Hədislər də bu şərhin yazılı vəsiqəsidir. Sünnəsiz müsəlman olmayacağı kimi, sünnəsiz müsəlmanlıq da ola bilməz.

Xülasə, ifadə edə bilərik ki, Hz. Peyğəmbərin sünnəsini onun söz və davranışları təşkil edir. Yəni onun kəlamları, davranışları və təsdiqlərinə sünnə deyilir.

İslam alimləri Hz. Peyğəmbərin bu xarakterdəki sünnələrini üç qurupda təsnif etmişdir.

## 1. SÜNNƏNİN NÖVLƏRİ

Termin mənasından da başa düşdüyümüz kimi sünnə üç növə bölünür: Qövlü, feli və təqriri. İndi də bunları incələyək:

### a. Qövli sünnə

Hz. Peyğəmbər əleyhissalamın bütün kəlamları bu növ sünnəyə daxildir. Şəkil və rəvayət formasıyla digərlərindən fərqlidir. ***Qalən-Nəbiyyu*** və ya ***Qalə Rasülullah,*** *"Hz. Peyğəmbər belə buyurmuşdur"* rəvayət terminlərilə ifadə edilir.

Bu hədis qövlü sünnəyə nümunədir:

اِيَّاكُمْ وَ الظَّنَ فَاِنَّ الظَّنَّ اَكْذَبُ الْحَدِيثِ. وَ لاَ تَحَسَّسُوُا وَ لاَ تَجَسَّسُوُا وَ لاَ تَنَافَسُوُا وَ لاَ تَحَاسَدُوُا وَ لاَ تَبَاغَضُوُا وَ لاَ تَدَابَرُوُا وَ كُونُوُا عِبَادَ اللهِ اِخْوَانا.

53 Müslim, Elm, 15; Nəsai, Zəkat, 64.
54 Yardım Ali, *Hadis,* s. 30, 31.
55 Buxari, Nikah, 1.

**TAPŞIRIQ**

Aşağıdakı rəvayətlərin sünnənin hansı növünə aid olduğunu boşluğa qeyd edin.

«Hz.Aişə deyir ki: "Rəsulullah (s.ə.s) oruca elə davam edirdi ki, biz: "(bu ay) heç iftar etməyəcək" deyərdik. Bəzən də elə davamlı yeyərdi ki, biz: "(bu ay) heç oruc tutmayacaq" deyərdik. Mən onun Ramazan xaricində bir ayı tam olaraq tutduğunu görmədim. Hər hansı bir ayda Şaban ayında tutduğundan daha çox tutduğunu da görmədim. (Buxari sovm 52, Müslim Siyam 175, 179)

(.............................)

Allahın Rəsulu belə dua edərdi: "Allahım, sənə təslim oldum, sənə inandım, sənə güvəndim, sənə yönəldim, yalnız sənin üçün mücadilə etdim, sənin hökmünə müraciət etdim. Ya Rəbbi, əvvəl işlədiyim, sonra işləyə biləcəyim, gizli və açıq günahlarımdan ötrü məni bağışla. Qulunu önə keçirən, arxada buraxan, ucaldan, alçaldan Sənsən! Səndən başqa tanrı yoxdur, Səndən başqası yoxdur. (Buxari Təhəccüd, 1)

(................................)

Hz. Peyğəmbər məsciddə uşaqları mizraqlarla hərb oyunları oynayarkən gördü və səsini çıxartmadı. (Buxari, Salat 69)

(.............................)

*Mömin, bir ilan deşiyindən iki dəfə sancılmaz.*
(Buxari, Ədəb, 83; Müslüm Zöhd, 63.)

*"Zənn bəsləməkdən uzaq durun. Çünki pis zənn, sözlərin ən yalan olanıdır. Bir-birinizin (gizli) danışığına qulaq asmayın. Bir-birinizin gizli hallarını araşdırmayın. Bir-birinizlə mənfəət yarışına girməyin. Bir-birinizə həsəd etməyin. Bir-birinizə kin bəsləməyin. Bir-birinizə arxa çevirməyin. Ey Allahın qulları qardaş olun"*[56]

**b. Feli sünnə**

Onun bütün fel və hərəkətləri bu növ sünnədən sayılır. Feli sünnələrdə ifadələr Hz. Peyğəmbərə (ə.s) aid deyildir. Onu görən və ya hadisəni nəql edən sahablərdən birinə aiddir. Rəvayət şəkli olaraq fərqli ifadələrdən istifadə olunur; ***"Kanən-Nəbiyyu*** *(Hz. Peyğəmbər belə idi, belə edərdi...)*, ***"Raəytün-Nəbiyyə*** *(Hz. Peyğəmbərin belə etdiyini gördüm)...* kimi ifadələrlə başlayan mətinlər feli sünnəyə işarə edir.[57]

**MÜTALİƏ EDİN**

Qurani-Kərimin Əhzab surəsi 21; Əli İmran surəsi 132, Nisa surəsi , 80, Ali imran surəsi 31-32-ci ayələrin tərcümələrini oxuyun.

Bu ayələri diqqətə alaraq Peyğəmbər (s.ə.s) itaət etmə mövzusunu yoldaşlarınızla mütaliə edin.

Feli sünnəyə nümunə olaraq bu hədisi göstərə bilərik:

رَاَيْتُ النَّبِيَّ اِذَا سَجَدَ وَضَعَ رُكْبَتَيْهِ قَبْلَ يَدَيْهِ

وَ اِذَا نَهَضَ رَفَعَ يَدَيْهِ قَبْلَ رُكْبَتَيْهِ

*"Allah Rəsulunu (s.ə.s) (namaz qıldığı vaxt) gördüm. Səcdəyə gedərkən dizlərini əllərindən əvvəl yerə qoydu. Səcdədən qalxarkən də əllərini dizlərindən əvvəl yerdən qaldırdı."*[58]

**c. Təqriri sünnə**

Hz. Peyğəmbərin hüzurunda başqaları tərəfindən söylənən sözlər, edilən işlər və ya özünə çatan xəbərlər qarşısında susması və yaxud bunları təriflməsinə ***"Təqriri Sünnə"*** deyilir.

Əbu Səid əl-Xudri anladır: "Səfərə çıxan iki dostun yanlarında su yox idi. Təyəmmüm edib namazlarını qıldılar. Daha sonra vaxt çıxmadan su tapdılar. Birisi dəstəmaz alıb təyəmmümlə qıldığı namazı yenidən qıldı, digəri qılmadı. Hadisəni anlatdıqlarında Rəsulullah (s.ə.s) namazını yenidən qılmayan səhabəyə; *"sən sünnəyə uyğun davrandın, namazın oldu."* Namazını təkrar qılan səhabəyə də; *"sənə də iki qat savab var"*[59] dedi.

**QEYD EDİN**

Quran və sünnədə açıq hökmü olmayan mövzularda səhabənin öz rəylərinə dayanaraq etdiyi əməlləri Hz. Peyğəmbərin qəbul etməsi də təqriri sünnəyə daxildir. Misal olaraq Hüzeyfəmin rəvayət etdiyi, *"Əshab Peyğəmbərimiz ilə eyni süfrədə yemək yediklərində, Rəsulullah yeməyə başlamayınca onlar əllərini uzatmazdılar*, hədisini göstərə bilərik. (Müslim, Əşribə 102)

Bu iki səhabənin eyni mövzuda fərqli davranmalarına baxmayaraq Peyğəmbərimiz hər ikisini də təsdiqləmişdir.

*Özünüz üçün istədiyinizi (mömin) qardaşız üçün də istəmədikcə (həqiqi) iman etmiş olmazsınız.*

(Buxari, İman, 7; Müslüm, İman, 71.)

---

56 Müslim, Birr, 28.

57 Peyğəmbərimizin Şəmailinə aid hədislər də feli sənnənin rəvayət metoduna bənzər şəkildə rəvayət olunmuşdur.

58 Əbu Davud, Salat, 57.

59 Nəsai, Təharət, 433.

## 2. SÜNNƏNİN HÖKMÜ VƏ DİNDƏKİ MÖVQEYİ

Sünnə Qurani-Kərimdən sonra İslam dininin ikinci əsasıdır. Çünkü uca Allah Peyğəmbərini İslam dinini təbliğ etməklə vəzifələndirmiş onun insanlar üçün gözəl nümunə olduğunu ifadə etmişdir. İnsan, təbii olaraq bəzi şəxsiyyətləri özünə nümunə və rəhbər olaraq seçmə xüsusiyyətinə malikdir. Nümunə alınan şəxs tarixi bir şəxsiyyət olduğu kimi, öz çevrəsindən biri də ola bilər. Bu vəziyyət daha çox, insanın özündən daha fərqli və daha üstün gördüyü şəxsi nümunə almaq təmayülündən meydana gəlir. Allah insanın fitri istedadına uyğun olaraq, onlara yol göstərmək və rəhbərlik etmək məqsədiylə göndərdiyi elçilərin də yüksək əxlaqla vəsiflənmiş və insanlar üçün nümunə alınacaq bir şəxsiyyət olaraq göstərmişdir. Şübhəsiz Peyğəmbər də bir insandır, ancaq adi bir insan deyil, bir insanın ola biləcəyi ən yüksək dərəcədə mükəmməl bir insandır.

**QEYD EDİN**

1. Sünnə Qurani-Kərimdən sonra İslam dininin ikinci qaynağıdır. Xüsusilə ibadət və tətbiqatlar sünnə ilə müəyyənlışdirilmişdir.
2. Sünnə, Quranın yaşanması və anlaşılması mövsuzunda İslam cəmiyyətinin əsas nümunəsidir. Odur ki, sünnəyə əsaslandırılmadan dini anlamaq və anlatmaq düzgün deyil
3. Allaha bəndə olmanın ölçüsü Hz. Peyğəmbərin sünnələridir. Buna görə də yaxşı və düzgün sirə və sünnə bilgisinə yiyələnmək labüddür.

Qurani-Kərimdə bir çox ayədə Peyğəmbərə (s.ə.s) itaət əmr edilir və qurtuluş yolu ona itaət etməyə bağlanmışdır.[60] Eyni zamanda deyə bilərik ki, dinin əmr və qadağalarını ancaq onun tətbiqatı əsasında düzgün anlamaq olar. Məsələn; Qurani-Kərimdə, "Namazın zamanlı olaraq fərz qılındığı"[61] bildirilmiş, ancaq bu zamanların müəyyən olunmasını, necə namaz qılınmasını, rükətlərini sayını Peyğəmbərimiz əleyhissalam açıqlamış və tətbiq edərək müsəlmanlara öyrətmişdir. Digər ibadətlər və hüquqi hökmlərlə əlaqəli və bunların necə yerinə yetiriləcəyini bildirən hədislər də buna daxildir. Deməк olar ki, hədis Qurani-Kərimin gizli (bilinməyən) və ümumi olan hökmlərini izah edir və açıqlayır. Odur ki, dini məqsədinə uyğun şəkildə düzgün anlamaq üçün Peyğəmbəri düzgün anlamaq lazımdır. Sünnə bir həyat tərzidir. O sadəcə İslam hüququnun qaynağı deyil, eyni zamanda ictimai həyatın tənzimlənməsi üçün bir ünsürdür. Bütün müsəlmanlar sünnənin dəlil olduğunu fikir birliyi ilə qəbul edirlər. Sünnənin dindəki mövqeyini vurğulayan bir çox ayə və hədislər vardır. Məsələn;

***Allah və Peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək*** *(öz ixtiyarları ilə ayrı cür hərəkət etmək)* ***yaraşmaz. Allaha və Onun Peyğəmbərinə asi olan kəs, şübhəsiz ki,*** *(haqq yoldan)* ***açıq-aydın azmışdır."***[62]. Bir başqa ayədə də Uca Allah insanları Peyğəmbərə (s.ə.s) müxalifət etməkdən çəkindirmiş və belə buyurmuşdur; **"... Onun** *(Allahın, yaxud Peyğəmbərin)* ***əmrinə qarşı çıxanlar başlarına gələcək bir bəladan, yaxud düçar olacaqları şiddətli bir əzabdan həzər etsinlər!"***[63]

*Qadınla dörd şeyə görə nikah bağlayırlar: sərvətinə, əsilnə¬səbinə, gözəlliyinə və dindarlığına. Sən (digərlərini deyil), dindar olanını seç ki, hüzur tapasan".*

(Buxari, Nikah 15; Müslim, Rada 53)

60 Bax. Əhzab 33/21; Ali İmran, 2/132; Nisa, 4/80,.
61 Nisa, 4/103.
62 Əhzab, 33/36
63 Nur, 24/63

Peyğəmbərin vida həcci əsnasında son tövsiyələri olaraq dilə gətirdiyi ifadələr buna açıq bir şəkildə işarə etməktədir:

*"Sizə, tabe olduğunuz müddət ərzində sapıtmayacağınız iki şey bıraxdım; Allahın Kitabı və Rəsulunun sünnəsi".*[64]

Buna görə ortaya qoyulacaq hər hansı görüş və ya tətbiqə, ancaq bu iki qaynağa nisbət etmək surətiylə İslami xarakteristika qazandırmaq mümkündür. Əksinə ortaya çıxacaq tətbiqin və yaxud quruluşun İslama uyğunluğundan söz etmək olmaz. Bu və buna bənzər ayələr sünnənin dindəki mövqeyini açıq şəkildə bizə göstərir. Sünnə olmadan dinin yarımçıq olacağı açıq şəkildə görünür. Quran və sünnə çərçivəsində yaşanan dini iki qanadlı bir quşa bənzədə bilərik. Necə ki, bir qanadla quşun uçması mümkün deyilsə, Quran və sünnənin hər hansı biri diqqətə alınmadan da din düzgün anlaşılmaz və tətbiq edilməz.

Nəticə olaraq ifadə edə bilərik ki, sünnə İslam dininin Qurandan sonra ikinci mənbəyi olduğu üçün əhəmiyyətlidir. İslamı tam və doğru bir şəkildə yaşaya bilmək üçün hədisləri öyrənmək şərt və vacibdir.

*Saçı-saqqalı ağarmış müsəlmana, Quran hökmlərinə riayətdə həddini aşmayan, Onu oxuyan və hökmlərinə əməl edən hafizə və adil idarəçiyə hörmət göstərmək Al-laha təzimdən qaynaqlanır".*
(Əbu Davud, Ədəb 20)

MÜZAKİRƏ EDİN

Dinin əldən çıxması sünnələrin tərk edilməsi ilə başlayar. Necə ki, kəndir, iplərin tək-tək qopması ilə bölünür, din də süünələrin tək-tək tərk edilməsi ilə parçalanar (Darimi Müqəddimə 16)

Bu hədis çərçivəsində Sünənin dindəki mövqeyi barəsində yoldaşlarınızla müzakirə edin.

## B. HƏDİS

Hədis kəlməsi, lüğətdə yeni, xəbər və söz mənalarına gəlməkdədir. Hz. Aişənin ənsara dua edərkən bu kəlməni "qədimin ziddi" yəni "yeni" mənasında işlətmişdir.

جَزَاهُمُ اللهُ فِي الْحَدِيثِ وَ الْقَدِيمِ

*"Həm köhnə həm də təzə həyatlarında Allah onları xeyirlə mükafatlandırsın".*[65]

Ayədəki (هَلْ آتَاكَ حَدِيثُ مُوسَى) ***"Musanın xəbəri sənə gəldimi?"***[66] ifadəsində də hədis kəlməsi xəbər mənasında istifadə edilmişdir.

Hədisin terminin tərifni belə ifadə edə bilərik: (Hz. Peyğəmbərin) S**öz, feil, təqrirlərdən ibarət sünnələrin kəlmələrlə ifadə şəklinə hədis deyilir.**

Hədisçilərə görə hədis termini sadəcə Peyğəmbərin söz fel və təqrirlərini deyil, eyni zamanda onun fiziki xüsusiyyətləri (şəmail) və vəsfləri ilə əlaqəli rəvayətləri də əhatə edir.

64 İmam Malik, Muvəttə, Qədər, 3.
65 Əhməd ibn Hənbəl, Müsnəd, VI, 8.
66 Taha, 20/9.

Hz. Peyğəmbərin Əbu Hüreyrəyə xitab edərək söylədiyi sözün içində keçən *“hədis”* termini, sanki sonraki dövürlərdə Hz. Peyğəmbərin sözlərinə hədis deyilməsi üçün göstərilən işarəyə bənzəməkdədir. Bu mətn belədir:

Əbu Hüreyrə Peyğəmbərə; “*Qiyamət günündə sənin şəfaətinə nail olacaq ən xoşbəxt şəxs kimdir ey Allahın Elçisi?”*-deyə soruşanda Hz. Peyğəmbər ona belə cavab vermişdi: *“...Ey Əbu Hüreyrə hədisə qarşı sevgini bildiyim üçün səndən öncə heç kimin bu* ***xəbər*** *haqqında mənə sual soruşmayacağını güman edirdim. Qiyamət günü mənim şəfaətimə nail olacaq ən xoşbəxt adam səmimi qəlbdən La ilahə illallah deyəndir”*.[67]

Hədis bir növ “Hz. Peyğəmbər bilgisi” mənasına gəlməkdədir. Tərifə görə, Hz. Peyğəmbəri tanıdan, Onun hər hansı bir cəhəti haqqında məlumat verən ilk üç nəsilə aid sözlü ifadələr də *hadis* olma vəsfini qazanmış olur. Hədis kəlməsinin cəmi əhadisdir.

Hədislə sünnə qavramı bir-birinə yaxın qavramlardır. Ilk dövrlərdə hədis və sünnə terminlərin bir-birinin yerinə istifadə edilmişdi. Son dövrlərdə isə fərqli mənalar qazanmışdır. Hədisçilər arasında məşhur olan görüşə görə hədis, nübüvvətdən əvvəl və nübüvvətdən sonra Hz. Peyğəmbərdən rəvayət edilən bütün söz, fel və təqrirlərdən ibarətdir; ancaq müsəlmanlara əmr edilən Sünnə, bu üç şəkildə ortaya çıxan və dinə aid olan hədislərdir

**TAPIN**

Aşağıdakı ayələrdə “hədis” kəlməsi hansı mənada istifadə edilmişdir.

فَلْيَأْتُوا بِحَدِيثٍ مِثْلِهِ اِنْ كَانُوا صَادِقِينَ

***Əgər doğru deyirlərsə, qoy onlar bunun*** *(bu Quran)* ***kimi bir kəlam gətirsinlər!*** (Tur, 52/34)

وَهَلْ اَتٰيكَ حَدِيثُ مُوسٰى

***Musanın hekayəti sənə gəlib çatdımı?*** (Taha, 20/ 9)

وَاَمَّا بِنِعْمَةِ رَبِّكَ فَحَدِّثْ

***Və Rəbbinin sənə olan nemətindən söhbət aç.*** (Duha, 93/11)

*Söz gəzdirənlər (cəzalarını çəkmədən ya da bağışlanmadan) cənnətə girə bilməzlər.*
(Müslüm, İman, 168, Tirmizi, Birr,79)

Hədis və Sünnə arasındakı fərqləri iki qrup halında xülasələşdirə bilərik:

**Birincisi:** Hədis, Peyğəmbərimiz (s.ə.s)in söz, fel və təqrirləri ilə bərabər onun sifətlərəini (şəmailini) də əhatə edir. Sünnə isə onun izlədiyi yolu ifadə edir. Buna görə hədis Peyğəmbərmizin (s.ə.s) sözünü və felini əhatə etdiyi halda, sünnə sadəcə felinə aiddir. Hədis, Peyğəmbərimizə (s.ə.s) nisbət edilən bütün rəvayətləri içinə aldığı üçün Sünnədən daha genişdir.

**İkincisi:** Sünnə, dini və hüquqi tətbiqə işarət edir, ancaq hər hədis, bir hökm və ya bir tədbiqatı əhatə etmir.

Hədislə sünnənin ortaq yönləri isə, ikisinin də Peyğəmbərimizə (s.ə.s) aid olması və rəvayət yolu ilə bizə çatmasıdır.

## A. HƏDİSİN BÖLMƏLƏRİ

Hər hansı hədis tətqiq etsən onun iki bölmədən meydana gəldiyini görərik. Sənəd və mətn. Bu ifadələrin nə məna kəsb etdiyini bərabər tətqiq edək.

67 Buxari, Elm, 33.

## 1. SƏNƏD

Sənəd kəlməsinin lüğət mənası “söykənilən şey, möhkəmlik, qüvvətli söz, güvənilən kəs” dir. Bu ifadənin termin mənası isə “hədisi rəvayət edən ravilərin adlarının qeyd edidiyi “isim zənciri”dir. Başqa ifadə ilə söyləsək bir sözün Rəsulullaha aid olduğunu göstərən sənəddir. Misal:

حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ قَالَ حَدَّثَنَا شُعبَةُ قَالَ حَدَّثَنِي أَبُو التَّيَّاحِ عَنْ أَنَسٍ عَنِ النَّبِيِّ (ص) قَالَ

İfadəsi sənədə nümunədir.




Sənəddə adları keçən şəxsə ravi deyilir. (حدثنا) və (عن) ləfizlərinə də rəvayət ləfizləri deyilir.

Sənədi raviyə, bir başqa ifadə ilə Hz. Peyğəmbərə nisbət etməyə isnad (sənəd zikr etmə) deyilir. Müasir dövrdə sənəd ilə isnad eyni mənalar üçün istifadə edilməkdədir.

Sənədə, “tariq (yol), vəch (yön, tərz)” də deyilir.

Hər hansı bir hədisin qəbul və rəddində yaxud da səhih, mövzu, zəyif, həsən, ahad kimi sinifləndirməyə tabe tutulmasında əvvəlcə sənədə baxılır və sənəddə yer alan ravilərin güvənilən, dürüst, ədalətli olma, yaddaşının qüvvətli olması və s. xüsusiyyətlərinə görə hədis dəyərləndirilir. Əgər ravilər lazımi şərtləri daşıyırsa və hədisin mətnində də bir qüsur yoxdursa o hədis səhih hədis kimi qəbul edilir.

Bütün bunlardan məlum olur ki, sənədin əhəmiyyəti iki nöqtədə qarşımıza çıxır. Hədisin səhihliyini təyin edib müəyyənləşdirmək üçün imkan hazırlamaq və rəvayət anarxiyasının qarşısını almaq.

*Üç dua vardır ki, bunlar şübhəsiz qəbul edilir: Məzlumun duası, qonağın duası, atanın övladına duası.*

(İbn Macə, Dua,11)

**BİLİRDİNİZMİ?**

SƏNƏDƏ NÜMUNƏ

Buxarinin Cami əs-Səhih adlı əsərindəki ilk hədisin sənədi belədir:

حَدَّثَنَا الْحَمَيْدِيُّ قَالَ حَدَّثَنَا سُفْيَانُ قَالَ حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدِ الْاَنْصَارِيِّ قَالَ اَخْبَرَنِي مُحَمَّدُ بْنُ اِبْرَاهِيمِ التَّيْمِيِّ اَنَّهُ سَمِعَ عَلْقَمَةَ بْنِ وَ قَّاصِ اللَّيْثِيِّ يَقُولُ سَمِعْتُ عُمَرَبْنِ الْخَطَّابِ رَضِيَ اللهُ عَنْهُ عَلَي الْمِنْبَرِ قَالَ: سَمِعْتُ رَسُولَ اللهِ صَلَّي اللهُ عَلَيْهِ وَ سَلَّمَ يَقُولُ:...

Sənədin tərcüməsi

Bizə əl-Huməydi hədis olaraq söylədi və dedi ki: Bizə Süfyan hədis olaraq nəql edib, “bizə Yəhya ibn Səid əl-Ənsari xəbər verdi” dedi. (Yəhya); Məhəmməd ibn İbrahim ət-Təymi, mənə Əlqamə ibn Vəqqas əl-Leysini belə söyləyərkən eşitdiyini xəbər verdi.”-dedi. (Əlqamə); “mən, Ömər ibn Xəttabı minbərdə bunları söylərkən eşitdim: **“Hz. Peyğəmbər əleyhissalamdan eşitdim, belə deyirdi:**

## 2. İSNAD

Sənəddəki ravilər vasitəsilə rəvayəti Rəsulullaha (s.ə.s) nisbət etməyə isnad deyilir. Sənəd və isnad terminləri bir-birinin əvəzinə istifadə edilən sinonim kəlmələrdir. Hər iki terminin cəmi "əsanid" dir.

İlk zamanda hədislər "Hz. Peyğəmbər buyurdu ki" ifadəsi ilə rəvayət edilirdi. Səhabə dövründə hədislər belə nəql edildikdə sağlamlığında heç bir şübhə yaranmırdı. Ancaq tabeilər dövründə vəziyyət tamamilə dəyişdi. Bir tabei, Hz. Peyğəmbəri görmədiyi üçün hədisi başqa birindən rəvayət edirdi. Buna görə də hədisi kimdən dinlədiyi bilinməli idi. Məhəmməd ibn Sirindən (vəfatı 110/728) gələn bir rəvayətdə bu hadisə belə əks olunmaqdadır: *"İlk zamanlarda isnad soruşulmurdu. Nə vaxt ki, müsəlmanlar arasında fitnə çıxdı, bizə rəvayəti dinlədiyimiz şəxsin adını soruşmağa başladılar. Nəticədə baxırdılar, əgər rəvayət əhli-sünnədən idisə qəbul edilər, əksinə bidət əhlindən idisə onların hədislərini rədd edirdilər".* [68]

**BİLİRDİNİZMİ?**

Əbu Hatim ər-Razi (vəfatı 275/888) belə demişdir: " Peyğəmbərlərə aid xəbərləri, Allahın Adəmi yaratdığı vaxtdan bəri, İslam ümmətindən başqa heç bir ümmət etina ilə mühafizə etməmişdir".



Bu xəbərdə də gördüyümüz kimi, isnad, müsəlmanlar arasında fitnənin zühurundan sonra soruşulmuşdur. Bu fitnənin hansı olduğu haqqında ixtilaflar vardır. Çoxunun qəbul etdiyi görüşə görə bu fitnənin Hz.Əli ilə Müaviyə arasında meydana gələn müharibə olduğu söylənilir. Çünki bu müharibənin sonunda müsəlmanlar qruplara ayrılmış, müəyyən siyasi və etiqadi məzhəblər meydana gəlmişdir.

Görüldüyü kimi sağlam hədisləri əsilsiz uydurma sözlərdən ayırmaq üçün hədis alimləri hədisləri nəql edənlərdən sağlam, etibarlı sənəd istəməyə tabeilər dövründə başlamışlar. Bu dövrdən sonra sənədsiz hədislərə etibar edilməməyə və heç bir dəyər verilməməyə başlandı. Zuhri Mədinədə İshaq ibn Abdullahın sənədsiz olaraq "Rəsulullah buyurdu ki..." deyərək hədis rəvayət etdiyini görəndə ona müdaxilə edərək, "Allaha qarşı bu cürətin nədir?. Hədisini isnad et. Bizə ipi, halqası olmayan hədislər rəvayət edirsən" deyərək onu təhdid etmişdir.

**MÜZAKİRƏ ET**

İmam Şafei (vəfatı 204/819) belə demişdir: *"Sənədsiz hədis öyrənmək istəyən şəxs gecə qaranlığında odun toplayana bənzəyir. O gecə odun zənn edib zəhərli ilanı da toplayar və bundan xəbəri olmaz"*

**İmam Şafeinin dəyərli görüşünü diqqətə alaraq isnadın önəmini və günümüzdə lazımlığını yoldaşlarınızla müzakirə edin.**

*Xeyrə vasitəçi olan, xeyir işləyən kimidir.*
(Tirmizi, Elm, 14)

68 Muslim, Müqəddimə, 5.

*Yaxşı və pis dost xoş qoxulu ətir satanla körükçü kimidir. Ətir satan ya sənə gözəl ətrindən verir, ya sən ondan pulla ətir alırsan, ya da xoş ətrindən qoxulamış olursan. Körükçü isə ya paltarını yandırar, ya da ən azı pis qoxu ilə narahatlıq verər".*

(Buxari, Zəbaih 31, Buyu 38; Müslim, Birr 146)

**YAZIN**

Aşağıdakı hadisin sənəd və mətnini müəyyənləşdirib boşluğa yazın

..............................

حدثنا أبو كريب حدثنا عبده بن سليمان عن
محمد بن عمرو عن ابي سلمة عن ابي هريرة قال
قال رسول الله صلَّى الله عليْه و سَلَّم لَوْ لَا اَنْ
اَشُقَّ عَلَي اُمَتِي لأَمَرْتُهُمْ بِالسِّوَاكِ عِندَ كُلِّ صَلَاةٍ

Bizə Əbu Qureyb rəvayət edib dedi ki, bizə Əbdə ibn Süleyman, Məhəmməd ibn Əmrdən, o, Əbu Sələmədən, o da Əbu Hüreyrədən rəvayət etdi ki, o belə demişdi, Rəsulullah əleyhissalam buyurdu:

............................

*"Əgər ümmətim üçün çətin olmayacağını bilsəydim, hər namaz vaxtında misvakdan istifadə etməyi əmr edərdim.* (Buxari, cümə 8)

Xəbəri mənşəyinə qədər çatdırma metodu, yəni isnad sadəcə İslam dininə aid olan bir metoddur. İslamdan əvvəl belə tətbiqata təsadüf edilməmişdir. Hədis rəvayətində İsnadın həqiqətən böyük önəmi var. Bunu alimlər belə ifadə etmişlər:

İbn Sirin: "Bu elm dindəndir. Dinini kimdən öyrəndiyinə diqqət et"[69]-demişdir.

Süfyan əs-Sövri (vəfatı 161/778): "İsnad möminin silahıdır. Yanında silahı yoxsa düşməni ilə necə savaşacaq?"[70]

Abdullah ibn Mübarək (vəfatı 181/797): "İsnad dindəndir. Əgər isnad olmasaydı din haqqında kim nə istəsə söyləyərdi"[71]. Yenə Abdullah ibn Mübarək: "Dini məsələləri isnadsız olaraq öyrətmək istəyən kimsə, nərdivansız dama çıxmaq istəyənə bənzəyir" demişdir.

Bunu da ifadə etmək lazımdır ki, sənədin yerini bu gün yazılı qaynaqlar əvəz etmişdir. Dünən, "Kimdən eşitmisən?"-deyə soruşulurdu, bu gün isə "Hansı hədis qaynağında yer almaqdadır?"-deyə soruşulmaqdadır. Deməki, bu gün bizim üçün sənəd, o hədisin sənədinin yer aldığı etibarlı hədis kitabıdır.

Elm adamlarının fikirlərinə görə: Quran xaricində, insanlıq tarixində heç bir hadisə, İslam Peyğəmbərinin sözləri qədər dərin, geniş, doğru və sağlam olaraq müəyyən edilməmişdir.

### 1. İsnadin Növləri

İsnad, ravi sayının az və ya çox olmasına görə ali isnad və nazil isnad şəklində ikiyə ayrılır:

#### a. Ali isnad

Son ravi ilə Hz. Peyğəmbər (s.ə.s) arasındakı ravilərin sayı ən az olan isnaddır. Rəvayəti qısa yoldan qaynağına çatdırdığına görə yanılma ehtimalı azdır və nazil isnada nəzərən daha mötəbərdir.

69 Müslim, Müqəddimə, 5.
70 Qasimi, *Qavaidut-təhdis,* s. 186; Xətib əl-Bağdadı, *Şərəfu əshabil-hədis*, s. 43.
71 Müslim, Müqəddimə, 5

Ancaq, ali isnad deyiləndə sağlam isnad başa düşülməlidir. Əgər ravilər arasında zəif və ya yalançılar varsa, sənəd nə qədər ali olsa da xəbərin heç bir dəyəri yoxdur.

**b. Nazil isnad**




Sənədində ravi sayısı çox olan isnaddır. Ravi sayısı artdıqca yanılma ehtimalının da artdığına görə, bu növ isnadların, ali isnadla müqayisədə dəyəri aşağıdır.

Sənəddə, eyni dövrdə yaşamış birdən çox ravinin olması o isnadı ali olmaqdan çıxarır.

Misal:

**حَدَّثَنَا مُحَمَّدُ بْنُ يُوسُفَ قَالَ حَدَّثَنَا سُفْيَانُ عَنْ عَمْرِو بْنِ عَامِرٍ قَالَ سَمِعْتُ اَنَسَ اَبْنِ مَالِكٍ يَقُولُ**: كَانَ النَّبِيُّ (ص) يَتَوَضَّأُ عِنْدَ كُلِّ صَلاَةٍ قُلْتُ: كَيْفَ كُنْتُمْ تَصْنَعُونَ؟ قَالَ: يُجْزِئُ اَحَدَنَا الْوُضوءُ مَا لَمْ يُحْدِثْ.

**Bizə Məhəmməd ibn Yusuf hədis olaraq nəql etdi və dedi ki: Bizə Süfyan Əmr ibн Amirin belə dediyini nəql edib dedi ki: "Ənəs ibn Maliki bunu söyləyərkən eşitdim**: *"Nəbi (s.ə.s) hər namaz vaxtında dəstəmaz alardı."* Mən "bəs siz necə edərdiniz?"-deyə soruşdum. Ənəs; "Bizə hadəs gəlməyincə (dəstəmazımız pozulmadıqca bir vaxtdan çox namaz üçün) bir dəstəmaz kifayət edərdi."-dedi.[72]

Eyni hədisin Tirmizidəki rəvayətinə gəlincə:

**حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَارٍ حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ قَالَ حَدَّثَنَا سُفْيَانُ بْنُ سَعِيدٍ عَنْ عَمْرِو بْنِ عَامِرٍ الْاَنْصَارِيِّ قَالَ: سَمِعْتُ اَنَسَ بْنِ مَالِكٍ يَقُولُ**: كَانَ النَّبِيُّ (ص) يَتَوَضَّأُ عِنْدَ كُلِّ صَلاَةٍ قُلْتُ: فَأَنْتُمْ مَا كُنْتُمْ تَصْنَعُونَ؟ قَالَ: كُنَّا نُصَلِّى الصَّلَوَاتِ كُلَّهَا بِوُضُوءٍ وَاحِدٍ مَا لَمْ نُحْدِثْ.

**Bizə Məhəmməd ibn Bəşar hədis olaraq söylədi və dedi ki: Bizə Yəhya ibn Səid nəql etdi və dedi: Bizə Süfyan ibn Səid, Əmr ibn Amirin belə dediyini bildirdi: Ənəs ibn Malikin belə dediyini eşitdim**: *"Nəbi (s.ə.s) hər namaz vaxtında dəstəmaz alardı"* Ona: Siz nə edərdiniz?" deyə soruşanda, Ənəs: "Biz, dəstəmazımız pozulmadıqca bütün namazları bir abdəst ilə qılardıq"-dedi.[73]

*Zərər vermək və zərərə zərərlə cavab vermək olmaz.*
(İbn Macə, Ahkam, 17; Muvatta, Akdiyyə, 31)

72 Buxari, Vudu, 54.
73 Tirmizi, Təharət , 60; Əbu Davud, Təharət, 171

**Yuxarıda qeyd olunan iki hədisi qrafik şəklində belə göstərə bilərik:**




*Cəbrail mənə qonşu haqqında o qədər çox tövsiyə etdi ki, mən, Allah Təalanın qonşunu qonşuya mirasçı edəcək diyə zənn ettim.*
(Buxari, Ədəb, 28, Müslüm, Birr, 140, 141)

Buxari və Tirmizinin rəvayət etdiyi eyni mətnli hədisdən Buxarinin sənədi Tirmizinin sənədinə nəzərən ali qəbul edilir. Çünkü ravi sayı daha azdır.

**D. MƏTN**

Hədis elmində mətn, rəvayətin, bir məna ifadə edən son və əsl bölümünə deyilir. Başqa tərifə görə mətn, sənəddən sonrakı sözlü bölmədir. Hədisin ən əhəmiyyətli qismi olan mətnə Rəsulullah əleyhissalamın sözləri daxil olduğu kimi, onun felləri və təqrirləri də daxildir.

Əslində hədis mətindən ibarətdir. Sənəd o mətinin Hz. Peyğəmbərə aid olub olmadığını incələməyə imkan verən ravilər zənciridir.

Hədis alimlərinin sənəd incələməsinə əhəmiyyət verərək mətin incələməsini diqqətə almadıqları zənninə düşməmək lazımdır. Onsuz da sənədin çox diqqətli incələnməsinin məqsədi mətindən düzgün nəticələr çıxarmaqdır. Ancaq bu da bir həqiqətdir ki, sənədlə məşğuliyyət mətinə nəzərən daha çoxdur.

Mətnə Nümunə:

اَنَّ النَّبِيَّ (ص) قَالَ: اٰيَةُ الْمُنَافِقِ ثَلاَثٌ, اِذَا حَدَّث كَذَبَ وَ اِذَا وَعَدَ اَخْلَفَ وَ اِذَا اؤْتُمِنَ خَانَ.

Rəsulullah (s.ə.s) buyurdu ki: *“Münafiqin əlaməti üçdür: Danışanda yalan söylər, vəəd etdiyi zaman sözündə durmaz, ona bir şey əmanət ediləndə ona xəyanət edər.*

## E. RAVİ

Lüğətdə, "nəql edən, daşıyan və çatdıran" mənasına gələn ravi kəlməsi termin olaraq "İstər qadın, istərsə də kişi olsun hədisi isnadı ilə bərabər rəvayət edən şəxsə deyilir.

### 1. Ravinin Şərtləri

Bir hədisin məqbul olması, hər şeydən əvvəl, onu rəvayət edən şəxslərin etibarlı olmalarına bağlıdır. Odur ki, bir ravinin rəvayətinin qəbul edilməsi üçün o ravi bəzi vəsfləri özündə cəm etməldir. Əsasən bunlar ədalət və zəbt sifəti olaraq qəbul edilmişdir. İndi bunlar haqqında məlumat verək:

#### a. Ədalət

Bir ravinin adil (ədalətli) qəbul edilməsi üçün onun din işlərində haqdan ayrılmaması, günahlardan uzaq durması və şəxsiyyətini alçaldıcı yalan, aldatma, zarafata düşkünlük, kimi hərəkətlərdən uzaq durması və yaxşılıq sahibi olması lazımdır. Bir ravi adil sayılması üçün bu xüsusiyyətlərə malik olmalıdır:

1. Müsəlman olmaq

Ravi bidət və xurafatlardan uzaq, sağlam və möhkəm bir imana sahib və ibadətlərini yerinə yetirən bir şəxs olmalıdır.

2. Ağıllı və yetkinlik yaşında olmaq

Mühəddislərə görə ravinin ağıllı olmasından məqsəd; ravinin, təmyiz qüdrətinə, yəni yaxşı ilə pisi, doğru ilə yanlışı, faydalı ilə zərərlini bir-birindən ayıra biləcək qabiliyyətə sahib olması və rəvayət etdiyi hədisi bilməsidir. Ağıllı olan, yəni yaxşı ilə pisi, doğru ilə yanlışı, faydalı ilə zərərlini bir-birindən ayıra biləcək qabiliyyətə sahib olan, rəvayət etdiyi hədisi bilən və həddi-büluğ yaşına çatmış olan ravi, -digər şərtləri də daşıyırsa- hədisi öyrənib almağa və rəvayət etməyə səlahiyyətli hesab edilir.

3. Təqva sahibi olmaq

Ravi, böyük günahlardan uzaqlaşmaq və kiçik günah işləməyi adət halına gətirməmək mənasına gələn təqva sifətinə malik olmalıdır.

#### b. Zəbt

Ravinin, rəvayət etdiyi hədisi tam və doğru olaraq eşitməsi, başa düşməsi, əzbərləməsi, hədisi eşitdiyi andan rəvayət etdiyi zamana qədər bu vəziyyəti qoruması və lazım olduğunda hədisin eynisini nəql edə bilməsidir.

**TAPŞIRIQ**

Raviləri ədalət və zəbt sifətlərinə görə incələyən elm olan **Cərh və Tədil** elmi barəsində hədis kitablarında məlumat toplayaraq yoldaşlarınızla mütaliə edin.

**QEYD EDİN**

Ədalət və zəbt sifətlərini özündə cəm edən raviyə **siqa ravi**, yəni etimad edilən ravi deyilir. Siqa ravinin rəvayət etdiyi hədislər ilə əməl edilir.

*"Ramazan ayında cənnət qapıları açılar cəhənnəmin qapıları isə bağlanar. Həmçinin şeytanlar da zəncirə vurular."*

(Buxari, Sovm 5; Müslim, Siyam 1)

**OXUYUN VƏ İZAH EDİN**

Aşağıakı ayəni ravi incələməsi yönündən izah edin.

يَا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اِنْ جَٓاءَكُمْ فَاسِقٌ بِنَبَاٍ فَتَبَيَّنُوٓا اَنْ تُصِيبُوا قَوْماً بِجَهَالَةٍ فَتُصْبِحُوا عَلٰى مَا فَعَلْتُمْ نَادِمِينَ

***"Ey iman gətirənlər! Əgər bir fasiq sizə bir xəbər gətirsə, dərhal*** *(onun doğruluğunu)* ***yoxlayın, yoxsa bilmədən bir qövmə pislik edər, sonra da etdiyinizə peşman olarsınız!"*** (Hucurat, 49/6)

*"Kim, fəzilətinə inanaraq və savabını da Allahdan gözləyərək ramazan orucunu tutarsa, keçmiş günahları bağışlanar."*

(Buxari, İman 28, Sovm 6; Müslim, Siyam 203, Müsafirin 175)

Hədisi yaxşı öyrənən ravinin zəbt sahibi olduğunu başa düşmək üçün, rəvayət etdiyi hədis, sağlam, möhkəm və siqa ravilərin hədisləri ilə qarşılaşdırılır. Əgər rəvayəti onların rəvayətlərinə çox zaman uyğun düşürsə o ravi zəbt sahibi qəbul edilir. Buna qarşılıq olaraq ravi, siqa ravilərə tez-tez müxalifət edir və rəvayət etdiyi hədislər siqa ravilərin rəvayətinə ümumiyyətlə uyğun gəlmirsə o ravi zəbt sifətini itirər və hədisi sübut üçün istifadə edilə bilməz.

## A. RAVİNİN İNCƏLƏNMƏSİ

Cərh və Tədil elmi nöqteyi nəzərdən ravilər, **mətaini-əşərə** deyilən on nöqtədən tənqid edilərək ayrı-ayrı ləfizlərlə dəyərləndirilir. Buna hədis elmində **tənqid nöqtələri** də deyilir.

Bu on nöqtədən beşi ravinin ədalət vəsfinə, beşi də zəbt vəsfinə aiddir. İndi də bunları sıralayaq:

### 1. Ravinin Ədaləti İlə Əlaqəli Olan Tan Nöqtələri

a. Kizbur-ravi

Ravinin, hədis rəvayətində yalançılığı, yəni Hz. Peyğəmbərin söyləmədiyi şeyi söylədi deyə, etmədiyini də etdi deyə rəvayət etməsidir.

Ən ağır qüsur budur. Ömründə bir dəfə də olsa hədisdə yalan söylədiyi sübut olunan ravinin, istər yalan söylədiyi zamandan əvvəl istərsə də sonra rəvayət etdiyi hədislərin heç biri qəbul edilməz. Çünki, digər hədislərdə də yalan söyləmə ehtimalı vardır.

b. İttihamur-ravi bil-kizb

Ravinin yalançılıqla ittiham edilmiş olmasıdır. Hədisdə yalançılığı sabit olmayıb, günlük həyat və danışmalarında yalançılığıyla tanınarsa rəvayətdə də yalan söyləyə bilər deyə rəvayətlərinə etibar edilmir.



c. Fisqur-ravi

Fisq ravinin sözlə və əməllə Allaha üsyan halında olmasıdır. İslamın əmr və qadağalarından hərhansı birinə diqqət etməyən və tabe olmayan şəxsə fasiq (günahkar) deyilir.

d. Bidətur-ravi

Ravinin, inkar və inad niyyəti daşımadan, yanlış şərhlə, İslam dininin etiqadi prinsiplərinə zidd olan bir inanca sahib olması və əhli-bidət içərisində yer almasıdır.

e. Cəhalətur-ravi

Hədisin sənədində yer alan ravinin bilinməməsi, tanınmaması halıdır.

**2. Zəbtlə Əlaqəli Tənqid Nöqtələri**

a. Kəsrətül-qələt

Ravinin yanılmasının çox olması və hədisi öyrənərkən və nəql edərkən yanılıb çaşdığını müəyyən etməsidir. Çaşması əlli faiz vəya daha çox olan ravinin rəvayətləri qəbul edilmir.

b. Fərtul-qəflə

Bir ravinin, əzbərlədiyi hədislərdə və ya digər işlərində çox diqqətsiz və dalğın olması deməkdir.

c .Vəhmur-ravi

Ravinin rəvayətini vəhm üzərinə bina etməsi, (hədisin mətn və sənədlərini dəqiq bilməyib bir-birinə qarışdırması) və nə rəvayət etdiyini bilməməsidir. Hətta cərh və tədildə doğru zənn edərək bəzi xətaları etməsi də vəhmə daxildir.

d. Muxaləfətus-siqat

Ravinin, hər yönündən güvənilən olan tanınmış bir siqa raviyə və ya özündən daha siqa olan bir kəsə müxalifətlə onların rəvayətlərinə zidd rəvayət etməsidir.

e. Suil-hifz

Ravinin hafizəsinin zəyif olması, hədisi səhv və ya əksik əzbərləməsi və tez unutması halıdır. Belə bir şəxsin səhvi doğrusundan, unutqanlığı əzbərindən çox olur. Unutma nəticəsində tez-tez səhvə düşən raviyə seyyiul-hifz də deyilir. Hafizəsi pozuq olanların rəvayətləri əsla qəbul edilmir.




*"Evlərinizi qəbirlərə çevirməyin. Şübhəsiz ki, Bəqərə surəsi oxunan evdən şeytan uzaqlaşar.*
(Müslim, Müsfirin, 212; Tirmizi, Səvabu'l-Quran 2)




*"Hər kim evindən çıxınca; `Allahın adı ilə, Allaha təvəkkül, güc və qüvvət Allahdandır`- desə ona `İşində ol. Sənə hidayət verildi, kifayətdir və sən mühafizə edildin`-deyilər. Nəhayət şeytan ondan üz döndərər.*

(Tirmizi, Dəavat 34; Əbu Davud, Ədəb 112)

Bütün bu xüsusiyyətlərdən ortaya çıxan həqiqət budur ki, İslam dini prinsiplərinə görə yaşamayan, günah işləyən, yalançı və bidət sahibi olan, səfeh və zindiq olan, nə rəvayət etdiyini bilməyən, çox xəta edən, hafizəsi zəyif olan, rəvayətdə dəqiq davranmayan, siqa ravilərin rəvayətlərinə zidd rəvayət edən şəxslərin hədsiləri səhih qəbul edilməz. Hətta mühəddislər, küçələrdə yemək yeyən, zarafat və əyləncəyə düşkün olan, oyunlar oynayan, musiqi alətləri ilə əylənən şəxslərin rəvayətlərini qəbulda çox şiddətli davranmışlar.

## F. RƏVAYƏT

Rəvayət (الرواية) kəlməsi daşımaq, nəql etmək deməkdir. Hədis elmində isə rəvayət hədis və sünnələrin nəql edilməsində deyilir. Rəvayətin məqsədi Hz. Peyğəmbərin hədislərini sonrakı nəsillərə düzgün şəkildə çatdırmaqdır. Hədislər günümüzə qədər rəvayət yolu ilə gəlib çatmışdır. Hədis rəvayəti hədis elminin çox önəmli mövzularından birini təşkil edir. Məhz buna görə də, hədis alimləri müxtəlif hədis rəvayət etmə metodları meydana çıxarmışlar. İndi isə o metodlardan ən əsaslarını öyrənək:

## 1. RƏVAYƏT ÜSULLARI

### a. Səma

Alimlərin çoxuna görə hədis rəvayət etmə yollarının ən üstünü səmadır. Səma ravinin rəvayət etdiyi hədisin kəlməsini, bilavasitə öz şeyxinin ağzından eşitməsi deməkdir. Bu metodda şeyx hədisi ya əzbərdən və ya yazılı bir mətndən oxuyar, tələbə də ya əzbərləyər və ya yazar, yaxud da həm yazar həm əzbərləyər. Əgər şeyxin oxuduğu hədisləri tələbələr yazarsa, buna "imla metodu" da deyilir.

### b. Qiraət (ərz)

Kəlmənin mənasından da görüldüyü kimi, tələbənin əldə etdiyi hədislərini müəllimə oxumasına qiraət deyilir. Bu oxuma əzbərdən və ya yazılı mətndən ibarət ola bilər. Hansı halda olursa olsun, oxunan hədislərə hədis aliminin tamamən bələd olması, lazımsa öz kitabından izləməsi şərtdir. Əgər xətalar varsa şeyx bu xətaları mütləq düzəltməlidir.

### c. İcazət

Şeyx tələbəsinə öz hədislərini rəvayət etməsi üçün yazılı və yaxud da şifahi şəkildə icazə verməsidir. Səma və qiraət metoduyla hədis almaq mümkün olmayınca bu metoda müraciət edilmişdir. Məsələn, əgər tələbə bir şəhərdə şeyxi isə başqa bir şəhərdə isə onların görüşmələri mümkün deyil. Bu məqamda tələbə o şeyxə məxsus hədisləri rəvayət etmək üçün ondan icazə istəyər. Şeyx icazə verərsə o hədisləri rəvayət edə bilər yox əgər icazə verməsə o hədisləri rəvayət etmə səlahiyyəti yoxdur.

*"Allah bu Quranla bəzi qövmləri yüksəldir, bəzilərini də alçaldır."*
(Müslim, Müsafirin 269)

## 2. RƏVAYƏT NÖVLƏRİ

Günümüzə qədər hədislər iki şəkildə rəvayət olunmuşdur. Ləfzən və mənən rəvayət. İndi də bu mövzunu incələyək:

**QEYD EDİN**

Hədisi məna ilə rəvayət edən şəxs Ərəb dilini və lüğət elmini bütün incəlikləriylə bilməlidir.

Kəlmənin bütün mənalarını bilməlidir

Hədisi, mətnindəkindən fərqli sözlərlə rəvayət etdikdə, o hədisdən çıxan mənanı qoruyaraq doğru bir şəkildə ifadə etməlidir.

Dəyişdirilən kəlmələrin yerinə sinonimlərdən istifadə etməlidir. Məsələn; quud yerinə culus kimi.

Rəvayət etdiyi hədisi və mənasını doğru olaraq bilməlidir.

Məna ilə rəvayət edilən hədis, ləfizləri ilə ibadət edilən hədis olmamalıdır. Məsələn, təhiyyat (əttəhiyyatu) duası kimi. Bunun kimi ləfizlərlə qulluq, dini göndərənin muradına daxildir.

Hədis, sifət (Allahın sifətləri kimi) hədisləri kimi mütəşabeh olmamalıdır.

Cəvamiul-kəlim növündən olmamalıdır.

“*Quran oxuyan mömin portağal kimidir: Ətri xoş dadı gözəldir. Quran oxumayan mömin xurma kimidir: Ətri yoxdur, dadı isə gözəldir. Quran oxuyan münafiq reyhan (nanə) kimidir: Ətri xoş, fəqət dadı acıdır. Quran oxumayan münafiq isə Əbu Cəhil qarpızı kimidir: İyi yoxdur dadı da acıdır.*”

(Buxari, Fəzailul-Quran, 17; Müslim, Müsafirin, 243)

YADDA SAXLA.

Aşağıda qeyd edilən rəvayət metodları çox nadir istifadə edilən rəvayət metodlarıdır.

Münavilə: Şeyxin (hədis müəllimi), rəvayət etməsi üçün tələbəsinə bir kitab və ya yazılı bir neçə hədis səhifəsini əlinə verməsidir.

Kitabət: Şeyxin, hədislərin bir qismini və ya hamısını əliylə yazaraq və ya yazdıraraq tələbəsinə verməsi və ya göndərməsidir

İ`lam: Şeyxin, hədis yazılı mətni və ya hədis kitabını tələbəsinə göstərib, rəvayətinə icazə verdiyini ifədə etmədən “bu mənim filankəsdən rəvayətimdir” söyləməsidir.

Vəsiyyət: Şeyxin, ölümü yaxınlaşanda və ya səyahətə çıxma əsnasında kitabı tələbəsinə vəsiyyət yoluyla bıraxmasıdır.

Vicadət: Bir şəxsin, bir şeyx ilə görüşüb yazısına heyran olduğu, özünü yaxşıca tanıyıb etimad etdiyi bir şeyxin xəttiylə (əl yazısıyla) yazılmış bir hədis kitabını tapması və ya əldə etməsidir.

**a. Ləfzən rəvayət**

Ləfzən rəvayət, bir hədisin Peyğəmbər Əfəndimizin söylədiyi şəkildə və eyni ifadələrlə rəvayət edilməsidir. Hz. Peyğəmbər bir hədisdə belə buyurmuşdur: “ *Kim bizdən bir hədis öyrənərsə və öyrəndiyi kimi başqalarına çatdırarsa Allah onun üzünü ağartsın”*[74].

Hədis ləfzən rəvayət edilərkən həmin hədisin sözlərinin yerləri dəyişdirilməz, bir kəlmə çıxarılıb onun yerinə -eyni mənaya da gəlsə- başqa bir söz qoyulmaz. Peyğəmbərimiz o hədisi necə söyləmişsə o şəkildə rəvayət edilir.

**b. Mənən rəvayət**

Məna ilə rəvayət; ravinin, ifadələrini yaddaşında tam olaraq tuta bilmədiyi bir hədisin mənasını, öz ifadələrilə əslinə tam uyğun bir şəkildə izah etməsidir.

Hz. Peyğəmbər özünə müraciət edib hədisləri əzbərlədikləri halda vaxt keçdikcə hədisləri xatırlamaqda çətinlik çəkən səhabələrə belə demişdir: *“Haramı halal, halalı da haram etməyəcək şəkildə mənanı pozmadığınız müddətcə, hədisləri fərqli kəlmələrlə (mənən) rəvayət etməkdə heç bir problem yoxdur.”*[75]



74 Tirmizi, Elm 7; Əbu Davud, Elm, 10; İbn Macə, Müqəddimə, 18; Əhməd ibn Hənbəl, Musnəd. V/183

75 Xətib, *Kifayə*, s. 199-200.

## İKİNCİ FƏSLƏ AİD SUALLAR

Rəvayətin qisimləri nələrdir?

Sünnənin dindəki mövqeyi nədir?

Sənəd və isnad arasındakı fərqlər nələrdir?

Ravinin tən nöqtələri nələrdir?

Mənən rəvayət etmək üçün nələrə diqqət yetirilməldir?

Test sualları

**1. *“Allah Rəsulunu (s.ə.s)* (*namaz qıldığı vaxt*) *gördüm. Səcdəyə gedərkən dizlərini əllərindən əvvəl yerə qoydu. Səcdədən qalxarkən də əllərini dizlərindən əvvəl yerdən qaldırdı.”* Hədisi hansı sünnə növüdür?**

a) Qövlü sünnə

b) Feli sünnə

c) Təqriri sünnə

d) Mərfu sünnə

**2. Aşağıdakılardan hansı hədis rəvayət etmə üsullarından deyildir?**

a) Kitabət

b) İcazət

c) Sual soruşma

d) Vicadə

**3. Hədis qaydaları, əsasları və səhih olanı uydurma olanından ayırma qaydalarından bəhs edən elmə nə deyilir?**

a) Dirayətul hədis

b) Rəvayətul hədis

c) Təbəqətul hədis

d) Qəribul hədis

**4. Aşağıdakı hansı zəbt sahibi ravi üçün gərəkli xüsusiyyətdir?**

a) Yaxşı geyinmək

b) Zəngin olmaq

c) Zarafatcıl olmaq

d) Çox danışmaq

e) Əzbərin qüvvətli olması

**5. İlk isnad tətbiqi hansı dövrdə başlamışdı?**

a) Səhabə dövründə

b) Tabeun dövründə

c) Muxadram dövründə

d) Ətbaut tabiin dövründə

**Boşluğu doldurun**



**1. Hədis............... ibarətdir.**

a) Sənəddən

b) Mətndən

c) Sənəd və mətndən

d) Heç birindən

**2. Hədis ravisinin etimadlı olmasına ...... deyilir.**

**3. …………Ravinin eşitdiyi sözü əzbərləməsi (mühafizə) etməsidir.**

**4. Raviləri ədalət və zəbt sifətlərinə görə incələyən elmə …………deyilir.**

## ÜÇÜNCÜ FƏSİL

# HƏDİSLƏRİN TƏSNİFATI

### HAZIRLIQ TAPŞIRIQLARI

1. Qüdsi və Mərfu hədis terminlərinin mənasını araşdırın.
2. "Səhih, Həsən və Zəyif" hədislərinin mənalarının Dini Terminlərin kitabından araşdırın və dəftərinizə qeyd edin.
3. İnsanların nə üçün Hz. Peyğəmbərin adına hədis uydurduğunu Hədis Üsulu və Hədis Tarixi kitablarından araşdırın.
4. Uydurma hədislərin dinə verəcəyi zərərləri yoldaşlarınızla müzakirə edin.




## I. HƏDİSLƏRİN TƏSNİFATI

Hədisləri düzgün analiz edib başa düşmək eyni zamanda dini düzgün anlayıb yaşamaq deməkdir. Hədis alimləri hədisləri xüsusiyyətlətinə görə müxtəlif kategoriyarlara ayırmışlar. Odur ki, hədisləri düzgün anlamaq üçün sözü gedən bu kateqoriyaları bilmək və anlamaq mütləqdir.

*"Sizin ən xeyirliniz Quranı öyrənən və onu başqalarına öyrədəndir".*
(Buxari, Fəzailul Quran, 21)

### A. NİSBƏT BAXIMINDAN HƏDİSİN NÖVLƏRİ

#### 1. QÜDSİ HƏDİS

Mənası Allah Təalaya, söz və ifadəsi isə Peyğəmbərimizə aid olan hədislərə qüdsi hədis deyilir.

Qüdsi hədislər əsasən bu iki xüsusiyyətə malikdir:

1. Hz. Peyğəmbər tərəfindən Allaha nisbət edilir
2. Ümumiyyətlə Allahın sifətləri ilə əlaqəli mövzuları əhatə edir.

**QEYD EDİN**

Qüdsi hədislərə İlahi və Rəbbani hədislər də deyilir.

Nəbəvi hədisə nisbətən qüdsi hədislərin sayı daha azdır. Bunların sayı cəmi 200-ə qədərdir.

Qüdsi hədislər əsasən bu iki rəvayət ləfizləri ilə rəvayət olunur:

1 . قَالَ رَسُولُ اللهِ صلَّى الله عليْهِ وَ سَلَّم فِيمَا يَرْوِيهِ عَنْ رَبِّهِ عَزَّ وَ جَلَّ...

*"Peyğəmbər (s.ə.s) şanı uca olan Rəbbindən rəvayət edərək belə buyurdu."*

YADDA SAXLA

Qüdsi hədislərlə əlaqəli bir çox əsər qələmə alınmışdır. Bu əsərlərdən ən məş**huru** Əli əl-Qarinin **əl-Əhadis əl-Qüdsiyyə** adlı əsəridir.

**2** قَالَ رَسُولُ اللهِ(ص) قَالَ اللهُ تَعَالَي...

"*Allahın rəsulu əleyhissalam belə dedi: Uca Allah buyurdu...*

Qüdsi hədisə nümunə olaraq bu hədisi göstərə bilərik:

حَدَّثَنا ابُو مَعْمَرٍ حَدَّثَنا عَبْدُ الْوَارِثِ حَدَّثَنا جَعْدُ بْنُ دِينارٍ أبوُ عُثْمانَ حَدَّثَنا أبوُ رَجاءَ الْعُطَارِدِيُّ عَنْ ابنْ عَبَّاسٍ رَضِيَ الله عنهُما عَنْ النّبِيِّ صلّي الله علَيْهِ و سَلَّمَ فِيما يَرْوِي عن رَبِّهِ عزَّ و جَلَّ قال قال إنَّ اللهَ كَتَبَ الحَسَناتِ و السَّيِّئاتِ

Əbu Məmər, Əbdülvarisdən, o Cəd ibn Dinardan, o Osmandan, o Əbu Rəca Utarididən, o da İbn Abbasdan bizə xəbər Verdi ki, Peyğəmbər (s.ə.s) Uca Allahdan rəvayət edərək belə dedi; *Allah yaxşılıqları da, pislikləri də yazmışdır.* [76]

*"Fəzilətinə inanaraq və qarşılığını (savabını) Allahdan gözləyərək Qədr gecəsini ehya edənin keçmiş günahları bağışlanar"*

(Buxari, İmân 25, 27, 28, 35, Sovm 6, Təravih 1, Leylətü'l-qədr 1; Müslim, Müsafirin 173-176)

### a. Qurani-Kərim ilə Qüdsi hədis arasında fərq var?

Qüdsi hədisin mənası Allah Təalaya aid olsa da "mətluv"(oxunan) vəhy olmadığı üçün Qurani-Kərim olaraq qəbul olunmadığı kimi, tamamilə Rəsulullaha aid olmadığı üçün, Nəbəvi hədis də deyil. Qurani-Kərim və qüdsi hədislər arasındakı ortaq nöqtə, hər ikisinin də Allaha nisbət edilməsidir. Bununla yanaşı ikisi arasında mühüm fərqlər vardır:

Qurani-Kərimin mənası, ləfzi və tərtibi vəhyə əsaslanır. Qüdsi hədisin mənası Allaha ləfzi isə peyğəmbərə aiddir.

Qurani-Kərimin mənası, ləfzi və tərtibi mütəvatirdir. Qüdsi hədisin isə nə ləfzi nə də mənası mütəvatir deyil.

Qurani-Kərimi məna ilə rəvayət etmək olmaz, ancaq qüdsi hədisləri məna ilə rəvayət etmək olar

Qurani-Kərim namazlarda qiraət məqsədi ilə oxunur. Qüdsi hədislər isə namazda oxunmaz.

## 2. MƏRFU HƏDİS

ƏZBƏRLƏYİN

*Peyğəmbərə nisbət edilən kəlam, hərəkət, təqrir, əxlaqi vəsiflərə, (istər sənədi münqəti (kəsik) və ya müttəsil (kəsiksiz) olsun)* ***Mərfu*** *hədis deyilir.*

Hz. Peyğəmbərin (s.ə.s) sözlərini, davranışlarını və təqrirlərini ifadə edən bütün rəvayətlərə nəbəvi hədis və ya mərfu hədis deyilir.

Mərfu hədisi ümumilikdə ikiyə ayıra bilərik:

1. Açıq (Sərahətən) Mərfu
2. Hökmən Mərfu

76 Buxari, Riqaq 31

**a. Açıq mərfu**

Açıq bir şəkildə Hz. Peyğəmbər əleyhissalama nisbət edilən hədisdir. Beləki, hədisin içində Rəsulullah əleyhissalama aid bir söz, bir fel, bir təqrir vəya bir vəsfindən açıq şəkildə söz edilirsə bu hədis açıq (sərahətən) mərfu hədis kimi qəbul edilir. Eyni zamanda أُمِرْنَا كَذَا (bizə belə əmr edildi) edildi və yaxud نُهِينَا عَنْ كَذَا (bizə bu qadağan edildi) rəvayət ləfizləri ilə səhabə tərəfindən rəvayət edilən hədislər də açıq mərfu rəvayətlər olaraq qəbul olunur.

**b. Hökmən mərfu**

Bir səhabənin əvvəlki peyğəmbərlərə aid və ya gələcəkdə baş verəcək hadisələrlə əlaqəli və yaxud da o əməli edənə savab və ya əzab vəd edən mövzular haqqında verdiyi xəbərlərə "hökmən mərfu" deyilir. Səhabə bu mövzulara aid məlumatı ancaq Peyğəmbər əleyhissalamdan öyrənə bilər. Məhz buna görə də bu növ hədislər də mərfu hədislər kimi qəbul edilir.

**QEYD EDİN**

Səhabənin: "...اُمِرنَا اَنْ" "Belə etməklə əmr olunduq."; ". نُهِينَا عَنْ" Bunu etməkdən nəhy edildik" kimi ifadələrlə nəql etdikləri də eyni şəkildə hökmən mərfu sayılır.

Bütün İslam alimləri mərfu hədisi hüccət/dəlil olaraq qəbul etmişdir. Buna görə də mərfu hədislər bizim üçün mötəbərdir.[77]

77 İbn Salah, Müqəddimə, s. 41-48

*"Camaatla qılınan namaz, tək başına qılınan namazdan iyirmi yeddi dərəcə daha fəzilətlidir."*

(Buxari, Azan 30; Müslim, Məsacid 249)

**MÜTALİƏ EDİN**

حَدَّثَنَا مُحَمَّدُ بْنُ مَحْبُوبٍ حَدَّثَنَا حَفْصُ بْنُ غِيَاثٍ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ إِسْحَقَ عَنْ زِيَادِ بْنِ زَيْدٍ عَنْ أَبِي جُحَيْفَةَ أَنَّ عَلِيًّا رَضِيَ اللَّهُ عَنْهُ قَالَ مِنْ السُّنَّةِ وَضْعُ الْكَفِّ عَلَى الْكَفِّ فِي الصَّلَاةِ تَحْتَ السُّرَّةِ

"Namazda, əlləri bir-birinin üstündə və göbək altında bağlamaq sünnədəndir." (Əbu Davud , Salat, 118)

Bu hədisi mərfu hədisin növləri baxımından dəyərləndirin.

*İşa namazını camaatla qılan kəs, gecə yarısına qədər namaz qılmış kimidir. Sübh namazını camaatla qılan şəxs də bütün gecə namaz qılmış kimidir.”*

(Müslim, Məsacid 260)

**MÜTALİƏ EDİN**

Aşağıdakı hədisi mövquf hədisin özəllikləri baxımından incələyin

عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ قَالَ: لاَ يَحِلُّ لا مْرِئٍ مُسْلِمٍ يَبِيعُ سِلْعَةً يَعْلَمُ اَنَّ بِهَا دَاءً اِلاَّ اَخْبرَ بِهِ.

Üqbə ibn Amirdən rəvayət edildiyinə görə o, belə demişdir: “*Müsəlman bir adamın, bir malda qüsur olduğunu bildiyi halda o qüsuru müştəriyə xəbər vermədən satması halal deyildir.”* (Buxari, Büyu 19.)

**MÜTALİƏ EDİN**

Aşağıdakı hədisi məqtu hədisin xüsusiyyətləri baxımından tədqiq edin.

قَالَ مُجَاهِدٌ لَا يتَعَلَّمُ الْعِلْمَ مُسْتَحْيٍ وَلَا مُسْتَكْبِرٌ

Mücahidin belə dediyi rəvayət edilmişdir: *Utanan və təkəbbürlü insan elm öyrənə bilməz* (Buxari, Elm 50)

**PAYLAŞIN**

Əbu Hənifə məqtu hədisin hökmü ilə əlaqəli fikrini yoldaşlarınızla paylaşın. İmam Əzəm belə demişdit:

*Rəsulullah əleyhissalmadan gələn hədislərin başımızın üstə yeri var. Səhabələrdən gələn xəbərlər haqqında müxəyyərik (seçmə haqqımız var). Tabeundan gələn xəbərlərə gəlincə onlar da bizim kimi insanlardır (hüm rical nahnu rical).*

### 3. MÖVQUF HƏDİS

Səhabəyə nisbət edilən söz, fel, təqrir və davranışlara mövquf hədislər deyilir. Belə rəvayətlərə ona görə mövquf deyilir ki, o xəbərin isnadı səhabəyə qədərdir. Yəni kəlamlar Peyğəmbərə deyil, səhabəyə aiddir. Mövquf hədislər ümumiyyətlə “filan səhabə belə dedi” “filan səhabə belə etdi” kimi rəvayət ləfizləri ilə rəvayət olunur. Mövquf hədislər də sənədinə əsasən mərfu hədis kimi səhih, zəif və ya uydurma ola bilər.

Əsasən Hz. Peyğəmbərə aid olmayan Səhabə kəlamları olduğuna görə, mərfu hədis kimi dində dəlil sayılmır. Ancaq mərfu hökmündə olan mavquf hədislər isə mərfu hədislər kimi dində dəlil qəbul edilir.

### 4. MƏQTU HƏDİS

Hər hansı bir tabeuna nisbət edilən söz, fel və təqrirlərə məqtu hədis deyilir. Ətbaut-tabeun da tebeun kimi qəbul edilir. Yəni onların da söz, fel və təqrirləri məqtu hədis növünə daxildir.

Hədis terminlərinin tam şəkillənmədiyi ilk dövrlərdə məqtu termini münqəti mənasında istifadə edilmişdir.

Məqtu hədislərin də isnadları müttəsil və ya münqəti ola bilər. Məqtu hədis hüccət deyildir.

## B. RAVİLƏRİN SAYI BAXIMINDAN HƏDİSİN NÖVLƏRİ

Hədislərin bir qismi Peyğəmbərdən (s.ə.s) tək bir sənədlə, baziləri isə birdən çox sənədlə rəvayət edilmişdir. Bu baxımdan alimlər hədisləri mütəvatir və ahad olmaq üzərə iki qismə ayırmışdır.

### 1. MÜTƏVATİR HƏDİS

Hər təbəqədə yalan sözdə birləşmələri əqli cəhətdən mümkün olmayan bir topluluğun rəvayət etdiyi hədisə **mütəvatir** hədis deyilir. Mütəvatir hədislər eşitmə və görməyə bağlıdır. Mütəvatir hədislər dəqiq məlumat ifadə etdiyinə görə tənqidə tabe tutulmur. Buna görə də mütəvatir hədislər özündə heç bir şübhə olmayan səhih hədislərdir.

Mütəvatir hədis dəqiq (qəti) məlumat ifadə edir. Buna görə mütəvatir hədisi inkar edən şəxs dindən çıxar. Çünki belə bir inkar Peyğəmbər əleyhissalamı inkar deməkdir. Mütəvatir hədislərlə əməl etmək vacibdir. Mütəvatir hədislər dəlillik baxımından Qurana çox yaxındır.

**Mütəvatir Hədisin Növləri**

Mütəvatir hədis ləfzi və mənəvi olmaq üzərə ikiyə ayrılır.

**1. Ləfzən mütəvatir**

Bütün rəvayətlərində ləfzləri eyni olan xəbərlərə ləfzi mütəvatir deyilir. Yəni xəbər Hz. Peyğəmbərin mübarək ağzından çıxdığı şəkildə rəvayət edilirsə buna ləfzi mütəvatir deyilir. Ləfzi mütəvatir hədislərin sayısı çox azdır. Ləfzi mütəvatirə misal olaraq

مَنْ كَذَبَ عَلَيَّ مُتَعَمّدا فاليَتَبَوّأْ مَقْعدَهُ من النّار

*"Kim bilərək mənə yalan isnad edərsə cəhənnəmdəki yerinə hazırlaşsın"* hədisi göstərilir. [78]

Ləfzən və ya mənən deyə qeyd edilmədən mütəvatir kəlməsindən istifadə edilirsə, ləfzən mütəvatir hədis nəzərdə tutulur.

**YADDA SAXLA.**

Bir hədisin mütəvatir qəbul edilməsi üçün aşağıdakı şərtlərə sahib olmalıdır.

**1. Böyük bir topluluq tərəfindən rəvayət edilməsi.**

**2. Bu topluluq sənədin hər təbəqəsində mövcud olmalıdır.**

**3. Bu topluluğun yalan üzərinə birləşmələri mümkün olmamalıdır.**

**4. Xəbəri rəvayət edən şəxslər o xəbəri ilk mənbəsindən eşitməli və ya şəxsən gözləri ilə görməlidir.**

*"Allah bu Quranla bəzi qövmləri yüksəldir, bəzilərini də alçaldır."*
(Müslim, Müsafirin 269)

78 Buxari, Elm, 38, Cənaiz, 33, Ənbiya, 50, Ədəb 109; Müslim, Zöhd, 72.

**2. Mənən mütəvatir**




Ləfzləri fərqli olduğu halda eyni məna ifadə edən hədislərə mənən mütəvatir deyilir. Məsələn, Hz. Peyğəmbərin dəstəmaz alması, namaz qılması, oruc tutması, həcc etməsi barəsində fərqli ləfizlərlə rəvayət edilmiş bir çox hədis var. Bunların əksəriyyəti təvatür dərəcəsinə yüksəlməktədir. Daha açıq bir misalla ifadə etsək, yüzə yaxın hədisi şərifdə Peyğəmbərimizin dua edərkən əllərini açıb qaldırdığı, fərqli-fərqli hadisələr olaraq qeyd edilmişdir. Burada mütəvatir olan məna dua edərkən əllərin qaldırılmasıdır. Odur ki, dua edərkən əllərin qaldırılması mənəvi təvatürlə bizə çatmışdır.

## 2. AHAD HƏDİSLƏR

Mütəvatir hədisin şərtlərini daşımayan hədislərə ümumi olaraq ahad hədislər deyilir. Belə rəvayətlərə xəbəri-vahid və xəbəri ahad deyilir. Əgər bir hədisin sənədinin bəzi təbəqələrində ravilərin sayısı mütəvatir hədis sayısına çatarsa o hədis mütəvatir deyil ahad hədis kimi qəbul edilir. Eyni şəkildə ilk təbəqələrdə ravi sayısı mütəvatir hədisin ravi sayısı qədər ikən sonrakı təbəqələrdə azalarsa yenə də ahad hədis olur. Odur ki, Hz. Peyğəmbərdən (s.ə.s) rəvayət edilən hədislərin əksəriyyəti ahad hədislərdir.

Ahad xəbər nəzəri elm ifadə edir. Yəni ifadə etdiyi elmin tədqiq edilməsinə ehtiyac vardır.

Ahad Hədis, hər təbəqədəki ravi sayına görə üç qismə ayrılır. Məşhur, Əziz və Qəriibn

**1. Məşhur hədis**

Hər təbəqədə ən azı üç və daha çox ravisi olan hədislərə məşhur hədis deyilir. Məsələn; bir hədisi səhabədən ən azı üç, tabeundən üç və ətbaut-tabeundan üç nəfər rəvayət etmişsə, o hədis məşhur hədis qəbul edilir. Məşhur hədislər iki qisimdir.

**a) Sənəd tədqiqi baxımından məşhur hədislər**

**b) Şöhrət baxımından məşhur hədislər**

Sənəd tədqiqi baxımından məşhur hədislər səhih, həsən və zəif ola bilər.

Səhih olan məşhur hədisə misal olaraq bu hədisi göstərmək olar:

حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ يُوسُفَ قَالَ أَخْبَرَنَا مَالِكٌ عَنْ نَافِعٍ عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَاأَنَّ رَسُولَ اللَّهِ
صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ إِذَا جَاءَ أَحَدُكُمْ الْجُمُعَةَ فَلْيَغْتَسِلْ

Bizə Abdullah ibn Yusif xəbər verdi, dedi ki; bizə Malik ibn Ənəs, Nafidən o da Abdullah ibn Ömərdən rəvayət edərək bildirdi ki, Rəsulullah (s.ə.s) belə bu-

*"Fəzilətinə inanaraq və qarşılığını (savabını) Allah-dan gözləyərək Qədr gecəsini ehya edənin keçmiş günahları bağışlanar"*

(Buxari, İmân 25, 27, 28, 35, Sovm 6, Təravih 1, Leylətü'l-qədr 1; Müslim, Müsafirin 173-176.)

yurdu: “*Hər kim cümə namazına gələcəksə, yuyunsun*”[79]. Bu hədisi şərif bir neçə təriqlə Hz. Peyğəmbərdən (s.ə.s) nəql edilmişdir.

Bundan başqa sənədin vəziyyətindən asılı olmayaraq, əsli olsun və ya olmasın, xalq arasında məşhur olan bütün hədislərə də məşhur hədis deyilmişdir. Ayrıca məşhur hədislərin fiqh alimləri, üsul alimləri, ədəbiyyatçılar arasında da (sənədi diqqətə alınmadan) şöhrət qazanmış növləri də vardır. Bu hədislər səhih və ya həsən olduğu kimi, uydurma da ola bilər. Məsələn;

مَنْ غَشَّنا فَلَيْسَ مِنّا

“*Bizi aldadan bizdən deyil*”[80] hədisi səhih hədisdir.

لَولاكَ لَولاكَ لَما خَلَقْتُ الاَفْلاكَ

“*Sən olmasaydın, sən olmasaydın (Ey Muhamməd (s.ə.s)) kainatı yaratmazdım.*”[81] Bu hədis hər nə qədər məşhur olsa da Hz. Muhamməd əleyhissalama qədər çatan heç bir sağlam sənədi yoxdur. Məhz buna görə də, hədis məşhur olsa da uydurma qəbul edilir.

**2. Əziz hədis**

Hər təbəqədə ən azı iki ravi tərəfindən rəvayət edilən hədislərə əziz hədis deyilir. Bəzi təbəqələrdə üç və yaxud daha çox ravisi olan hədis məşhur ikən sonrakı təbəqələrdən birində bu ravilərin sayı ikiyə düşərsə sözü gedən hədis məşhurluqdan çıxar və əziz olur.

**3. Qərib hədis**

Bir ravi tərəfindən rəvayət olunan və ya sənədin hər hansı təbəqəsində ravi sayısı birə düşən hədisə qərib hədis deyilir. Bu hədisə eyni zamanda fərd hədis də deyilir.

**QEYD EDİN**

Məşhur, əziz və qərib hədislər həm səhih, həm zəif həm də uydurma ola bilər. Rəvayət edən ravilərə görə sıralamağın səhihlik və zəifliklə heç bir əlaqəsi yoxdur. Odur ki, üç ravisi olan məşhur hədisin tək ravisi olan qərib hədisdən daha səhih olduğunu düşünmək doğru deyil. Çünkü hədislərin səhihlik şərtləri var və ancaq bu şərtlərə malik olan hədis səhih qəbul edilir.

## C. HÖKM BAXIMINDAN HƏDİSİN NÖVLƏRİ

Alimlər hədisləri dəlil qəbul edilib-edilməməsi baxımından məqbul (qəbul edilən) və mərdud (qəbul edilməyən) olmaq üzrə iki qrupa ayırıblar.

Məqbul hədislər də öz aralarında səhih və həsən olaraq ikiyə ayrılır.

*“Möminin işi heyrətamizdir. Belə ki, hər işi onun üçün bir xeyir səbəbidir. Bu cür xüsusiyyət ancaq möminə məxsusdur. Əgər sevinərsə şükür edər, bu onun üçün xeyir olar. Əgər başına bir müsibət gələrsə səbr edər, bu da onun üçün xeyir olar.”*

(Müslim, Zöhd 64)

---

79 Buxari, Cümə 2.
80 Müslim, İman 169.
81 Əcluni, *Kəşful-xəfa,* II, 164. 2123 nömrəli hədis.

## 1. SƏHİH HƏDİS

Hədis alimləri səhih hədisi belə tərif edirlər: Ədalət və zəbt sahibi ravilərin kəsiksiz (müttəsil) bir sənədlə bir-birlərindən rəvayət etdikəri şaz və illəli olmayan hədisə səhih hədis deyilir.

Bu tərifi misalla bərabər belə sxemləşdirə bilərik:

**SƏHİH HƏDİSİN XÜSUSİYYƏTLƏRİ**

- Səhih hədislərin raviləri adildir. Belə ki, hədisin sənədindəki ravilərin hər biri, müsəlman, həddi bülüğa çatmış, ağıllı və fasiq olmayan bir şəxsdir.
- Səhih hədislərin raviləri zəbt əhlidir. Zəbt, ravinin eşitdiyi hədisi uzun müddət sonra belə xatırlaya biləcək səviyyədə hafizəyə sahib olmağa deyilir. Bir ravinin zəbti, etibarlı ravilərin rəvayətlərinə ziddiyyət təşkil etməməsi ilə bilinir. Əgər ziddiyyət cüzi isə bu zəbtə mane olmaz.
- Səhih hədisin sənədi müttəsildir. Sənədin müttəsil olması, isnadındakı ravilərin, hədisi əvvəlki ravidən bilavasitə şəxsən alması və bu şəkildə o sənədin Hz. Peyğəmbər əleyhissalama qədər kəsintisiz şəkildə çatmasıdır.
- Səhih hədis şaz deyil. Şaz, Siqa ravinin, özündən daha güvənli və ya eyni səviyyədəki ravilərin rəvayətlərinə zidd hədis rəvayət etməsinə deyilir. Deməli səhih hədisi rəvayət edən ravi özündən güclü və ya eyni səviyyədə olan ravilərin rəvayətinə zidd hədis rəvayət etməyən biri olmalıdır.
- Səhih hədis müəlləl deyil. İllə hədisin sağlamlığına xələl gətirəcək gizli qüsur deməkdir. Odur ki, Səhih hədis xarici görünüm baxımından səhih görünsə də mütəxəssislər tərəfindən bilinəcək gizli qüsura sahib olmamlıdır.

Saydığımız bu şərtləri əksiksiz əhatə etməyən hədisi səhih hədis kimi qəbul etmək olmaz.

*“Əsil pəhləvan güləşdə rəqibini məğlub edən deyil, əsəbləşdiyi zaman əsəbinə hakim olandır.”*

(Buxari, Ədəb 76; Müslim, Birr 107, 108)

**1. SƏHİH HƏDİSİ TANIMA YOLLARI.**

Hədislərin səhih olub-olmadığını tanımaq üçün bəzi əsaslar vardır. Bunları belə sıralaya bilərik:

**1. Səhih hədis, Qurani-Kərimə və səhih hədislərlə səsləşir**. Əgər rəvayət olunan hədis Qurani-Kərimə və səhih hədislərə zidd isə o hədisə səhih hədis deyildir.

**2. Səhih hədis ağla zidd deyil**. İslam dini ağıla əhəmiyyət verən dindir. Əgər bir rəvayətdə ağla uyğun gəlməyən xüsuslar varsa ona hədis demək olmaz. Məsələn belə bir ifadənin hədis kimi rəvayət edildiyini görürük. “Nuhun gəmisi Kəbəni yeddi dəfə tavaf etdi. Sonra məqami-İbrahimdə iki rükət namaz qıldı.” Bu kəlam ağıl və məntiqə uyğun deyil. Heç bir ağıl bunun Peyğəmbər (s.ə.s) tərəfindən söylədiyini qəbul etməz.

**3. Səhih hədisin mətnində və ifadələrində uyğunsuzluq yoxdur.** Hz. Peyğəmbər ərəblərin ən düzgün danışan natiqi idi. O ərəb dilinin qrammatika qaydalarına diqqət edər və dinləyiciləri heyran qoyardı. Əgər bir hədisdə mənasız kəlamlar və qrammatika xətaları varsa, o ifadələrin Peyğəmbərin (s.ə.s) söylədiyini qəbul etmək düzgün deyil.

**4. Səhih hədis tarixi həqiqətlərə zidd deyildir.** Məsələn bir hədisdə Səd ibn Muazın şahidliyi və Muaviyənin də katibliyi ilə Hz. Peyğəmbərin Xeybər əhalisinə cizyə tətbiq etdiyi ifadə edilmişdir. Halbuki, cizyə ayəsi Təbük səfərindən sonra nazil olmuşdu. Muaviyə də Məkkə fəhtində müsəlman olmuşdu. Hədis tarixi həqiqətlərə uyğun gəlmədiyi üçün səhih qəbul edilməmişdir.

**5. Səhih hədis kiçik əməllərə böyük mükafatlar vəd etməz.** Məsələn “Quşluq vaxtında bu qədər namaz qılana,

**PAYLAŞIN**

Aşağıdakı məlumatı yoldaşlarınızla paylaşın və müzakirə edin.

Ağlın bir şeyi qavramaması ilə ağla zidd olması bir-birindən fərqlidir. Odur ki, ağılla anlaşılmayan hər hədisi qəbul etməmək doğru deyil. Məsələn, cənnət, cəhənnəm, sirat körpüsü kim axirətlə əlaqəli xəbərlər ağılla qavranmayan ancaq ağla zidd olmayan məlumatlardır.

**MÜZAKİRƏ EDİN**

**SƏHİH HƏDİSLƏR SADƏCƏ KÜTÜBÜ-SİTTƏDƏDİR?**

Ümumiyyətlə hədislər “Kütübü-sittə”də varmı və yaxud da “Buxari və Müslim bunu rəvayət edib mi?” kimi suallar soruşularaq tətqiq edilir. Belə suallar əslində səhih hədislərin sadəcə “Kütübi-sittə” və yaxud da “Buxari və Müslimin” əsərlərində yer aldığı və bunun xaricindəki əsərlərə etimad edilməyəcəyi düşüncəsinə bağlıdır. Bu çoxlarının hər şeyi Qurani-Kərimdə axtarmağına bənzəyir. Hər şeyi Qurani-Kərimdə axtarmaq nə qədər düzgün deyilsə, hər hədisi də Buxari və Müslimin əsərlərində və yaxud da Kütübü-sittədə axtarmaq da o qədər xətadır. Bu düşüncə və fikirdən uzaqlaşmaq lazımdır. Çünki “Buxari” və “Müslim” əsərlərini bütün səhih hədisləri toplamaq məqsədi ilə yazmamışdır. Onlar sadəcə əsərlərinə aldıqları hədislərin öz şərtlərinə görə səhih olmasına diqqət etmişdirlər.

“Buxari” və “Müslim” hətta “Kütübü-sittə” xaricindəki digər hədis əsərlərində də səhih hədislər vardır. Yeri gəlmişkən qeyd edək ki, alimlər Buxari və Müslimin əsərlərini daha güvənli qəbul etdikləri üçün hədisləri onlara görə sıralamışdır. Buna görə də Buxari və Müslimin hər ikisinin də rəvayət etdiyi hədislərə “Müttəfəqun-əleyh” adlandırmışdır. Müttəfəqun-əleyh hədislər ən güvənli hədislər kimi qəbul edilmişdir.

*“Heç kim başına gələn müsibətə görə ölümü arzulamasın. Əgər məcbur qalsa belə desin: `Ey Allahım! Mənim üçün yaşamaq xeyirli olduğu müddətə qədər mənə həyat ver. Ölüm xeyirli olduğu zaman da məni öldür`.”*

(Buxari, Mərda 19; Daavat 30; Müslim, Zikr 10)

yetmiş peyğəmbər savabı verilər." kimi hədislərin səhih olduğunu qəbul etmək sadəlövhlükdür.

## 2. SƏHİH HƏDİSİN HÖKMÜ

Səhih hədislə əməl etmək vacibdir. Şeyxan (Buxari və Müslim) tərəfindən rəvayət olunmasa belə səhih hədislərlə əməl etməyin vacib olması mövzusunda bütün İslam alimləri ittifaq etmişlər. Səhih hədisin ravilərinin tək bir nəfər olması ilə təvatür dərəcəsində olması arasında heç bir fərq yoxdur.

## 2. HƏSƏN HƏDİS

Sadəcə zəbt sifəti yönündən səhih hədis ravilərinin dərəcələrinə çatmayan ravilərin, kəsiksiz isnadla rəvayət etdikləri şaz və illəsiz hədislərə həsən hədis deyilir.

Həsən hədisi səhih hədisdən ayıran xüsusiyyət, ravisinin zəbt xüsusiyyətinin mükəmməl olmamasıdır.

**Həsən hədisin hökmü**

Hər nə qədər dərəcə baxımından səhih hədisdən aşağıda olsa da, fiqh alimlərinə görə hökm qoyma və əməl etmə xüsusunda səhih hədislər kimidir. Buna görə də Hakim əl-Neysaburi və İbn Hibban kimi bəzi hədisşünaslar öz əsərlərində həsən hədisləri də səhih hədislər sinfinə daxil etmişlər. Ancaq aralarında "təaruz" (ziddiyyət) olarsa səhih hədislərə üstünlük verilir.

*Yas saxlamaq cahiliyyət adətlərindəndir. Əgər yas tutan qadın ölmədən tövbə etməsə, Qiyamət günündə ona qətrandan bir köynək geyindiriləcək və o, əyninə cəhənnəm aləmindən bir köynək geyindirilmiş halda dirildiləcəkdir.*
(Müslim, Cənaiz, 29; İbn Macə, Cənaiz 52)

## 3. ZƏİF HƏDİS

Səhih və həsən hədisin şərtlərindən birini və ya bir neçəsini daşımayan hədislərə zəif hədis deyilir.

Zəif hədisin əlamətlərini belə sıralaya bilərik:

1. Hədisin raviləri adil deyildir.
2. Hədisin ravilərinin hafizəsi qüclü deyildir.
3. Hədisin isnadı kəsikdir. Yəni ravilərdən biri və ya bir neçəsi qeyd edilməmişdir.
4. Hədisin ravilərindən biri və ya bir neçəsi məchuldur, yəni bu ravilərin ədalət və zəbt baxımından vəziyyətləri bilinmir.
5. Hədis şəzdir, yəni səhih rəvayətlərə ziddir.
6. Hədis müəlləldir, yəni gizli bir qüsuru vardır və onun bu qüsuru da sübut edilmişdir.
7. Sözlərində, Peyğəmbərimiz əleyhissalamın sözlərindəki kimi ahəng yoxdur.
8. Ahad xəbərdir. Yəni bir çox kimsənin bilməsi lazım olan bir məsələni tək bir ravi xəbər vermişdir.

**PAYLAŞIN**

Zəif hədislərin dərəcələri 49 dan 510 qədər fərqli rəqəmlərlə ifadə edilmişdir. Ancaq bunlardan çoxu nəzəridir.

Bu əlamətlərdən birini və ya bir neçəsini daşıyan hədis, zəif hədisdir. Bu şərtlərdən birdən çoxu nöqsan olarsa, zəiflik daha da şiddətli olar

**a. Zəif hədislə əməl etməyin və rəvayət etməyin hökmü**

Zəif hədislə əməl etmək məsələsində alimlər ixtilaf etmişlər.

Alimlərin zəif hədislə əməl edilməsi barəsindəki görüşlərini belə sıralamaq olar:

Əhməd ibn Hənbəl və Əbu Davud kimi bəzi hədis imamlarına görə səhih hədisin olmadığı zaman, halal, haram, fərz və vacib kimi mövzularda da zəif hədislərlə əməl etmək olar. Ancaq hədis çox zəif olmamalıdır. Bu alimlərə görə zəif hədis rəydən (qiyas yoluyla ictihad) daha etimadlıdır.

Haram və halal xaricində müstəhəb və məkruh, gözəl əməllərə yönləndirmə və pis əməllərdən uzaqlaşdırmaq (tərğib və tərhib) üçün zəif hədislərlə əməl edilə bilər. Hədis, fiqh və əxlaq alimlərinin əksəriyyətinin görüşləri belədir.

Nə halal və haramla əlaqəli mövzularda, nə də əməllərin fəzilətləri ilə əlaqəli mövzularda zəif hədislə əməl etmək caiz deyil. Yəhyə ibn Məin, İbn Həzm və Əbu Bəkir ibn əl-Ərəbi kimi alimlər bu görüşü müdafiə edirlər.

Nəticə etibariylə zəif hədislə əməl etməyi qəti surətdə qadağan edənlərin görüşü zəif bir görüşdür. Hər nə şəkildə olursa olsun zəif hədislə əməl etməyi uyğun görənlərin görüşü də işi bəsitləşdirməkdir. Müəyyən qisimlərə ayırıb bəlli şərtlərə əsasən əməl ediləbiləcəyini ifadə edənlərin görüşü isə orta və doğru görüşdür.[82]

**b. Zəif Hədisin Növləri**

Qeyd etdiyimiz kimi zəif hədis bir neçə növə bölünərək incələnmişdir. Bu baxımdan ümumi olaraq zəif hədisləri iki əsasa görə sıralaya bilərik:

Sənədindəki inqitaya (kəsiklik) görə zəif hədislər

Ravisindəki cərh (tənqid) ediləcək xüsusa görə zəif hədislər

**1. Sənədindəki qopuqluğa görə zəif hədislər**

İnqita, istəyərək və ya istəməyərək, açıq və ya gizli, sənədin başından, ortasından və ya sonundan ən azı bir ravinin düşməsi surətiylə isnad zəncirinin kəsik (qopuq) hala gəlməsi deməkdir. Əgər isnadda belə bir inqita varsa və sənədindəki bütün raviləri siqa olsalar belə sırf bu inqitaya görə mətn rədd edilir.

İnqita səbəbilə zəif hədis növləri bunlardır: **Mürsəl, Münqəti, Mudal, Müəlləq, Müdəlləs.**

**a) Mürsəl hədis**

Təbeinin, isnadda səhabəni qeyd etmədən bilavasitə Peyğəmbərdən (s.ə.s) eşitmiş kimi rəvayət etdikləri hədislərə **mürsəl hədis** deyilir.

Tabeun hədisi Peyğəmbərdən (s.ə.s) rəvayət edən səhabəni göstərmədiyi üçün- hədisin isnadında qırılma meydan gəlmişdir. Məhz buna görə də belə isnadla rəvayət edilən hədislər zəif qəbul edilmişdir.

82 Ləknəvi, *əl-Əcvibə əl-fadilə,* s. 58.

*“İman etmədikcə cənnətə girə bilməzsən, bir-birinizi sevmədikcə də iman etmiş sayılmazsınız. Sizə elə bir şey öyrədimmi ki, onu etsəniz bir-birinizi sevərsiniz? Aranızda salamı yayın.”*
(Müslim, İman 93.)




Səhabənin bir-birindən eşitdikləri hədisləri, duyduğu şəxsin adını qeyd etmədən bilavasitə Peyğəmbər əleyhissalamdan rəvayət etməsiylə ortay çıxan hədislərə Səhabə mürsəli deyilir.

Hədisi Peyğəmbər əleyhissalamda duyan səhabənin adı qeyd edilmədiyinə görə tabei mürsəlinə bənzəyən sahəbə mürsəli hədis və fiqh alimlərinə gərə müttəsil və müsnəd hədis kimi dində dəlil qəbul edilmişdir.

### b) Münqəti hədis

Münqəti hədis, sənədin ortasında bir və ya ardıcıl olmamaq şərtilə bir neçə ravisi göstərilmədən rəvayət edilən hədisə deyilir. Eyni zamanda ətbau-tabein nəslindən olan bir ravinin tabeini keçərək səhabədən rəvayət etdiyi hədisə də münqəti hədis deyilir.




Münqəti hədis mürsəl hədisdən daha zəifdir. İsnadda qeyd edilməyən ravi və ya ravilərin kim olduğu və güvənli olub-olmadıqları bilinmədiklərinə görə münqəti hədis zəif qəbul edilir




### c) Mudal hədis

Sənədin hər hansı bir yerində ardıcıl iki və yaxud daha çox ravinin göstərilmədiyi hədislərə **Mudal hədis** deyilir.

Mudal hədis munqatı hədisdən daha zəifdir. Zəif hədis növlərindən biri olduğuna görə mudal hədis mərduddur. Dəlil olaraq istifadə etmək olmaz.




Bu sənəddə gördüyümüz kimi səhabə ravisi ilə tabeun ravisi düşmüşdür.

### d) Müəlləq hədis

Sənədin baş tərəfindən arxa-arxaya bir neçə ravinin və yaxud müntəhasına qədər sənədin tamamının həzf edildiyi (qeyd edilməyən) hədislərə müəlləq hədis deyilir.




*"Sizdən biriniz bir məclisə gələndə salam versin. Oturduğu məclisdən ayrılanda da salam versin. Əvvəl verdiyi salam, sonrakı salamdan üstün deyildir."*

(Əbu Davud, Ədəb 139; Tirmizi, İstizan 15)

Müəlləq hədis mərduddur. Onunla əməl etmək olmaz. Çünki hədisin qəbul edilmə şərtlərindən biri olan sənədin "müttəsil (kəsiksiz)" olma şərti, isnadındakı bir neçə ravinin qeyd edilməməsi ilə aradan qalxmışdır. Beləliklə qeyd edilməyən ravinin sağlamlıq dərəcəsini müəyyənləşdirmək olmadığına görə hədis mərdud qəbul edilir.

Müəlləq hədis mudal hədisdən daha zəifdir.

**QEYD EDİN**

Son dövrlərdə yazılan hədis kitablarındakı sadəcə səhabə ravisi qeyd edilən hədislər də "Müəlləq hədis"dir. Ancaq bu hədislərin sənədləri, yəni kəsiksiz sənədləri əsl mənbələrdə qeyd edildiyinə görə səhihliklərinə xələl gəlməz.

**2. Ravinin vəziyyətinə görə zəif hədislər**

Ravidə tənqid nöqtələrindən biri və yaxud da bir neçəsi olmasına görə zəif qəbul edilən hədislərdir.

**a) Münkər hədis**

Münkər hədis barəsində iki tərif verilmişdir.

Birincisi zəif bir ravinin siqa raviyə müxalif olaraq rəvayət etdiyi hədisdir. Alimlərin çoxunun qəbul etdiyi tərif budur.

İkinci isə, siqa raviyə müxalif olmasa belə, bir ravinin tək başına rəvayət etdiyi hədislərə münkər hədis deyilir. Buna görə ravi zəif olsun və ya siqa olsun rəvayətində tək qalmışsa və rəvayət etdiyi hədis digər hədisşünaslar tərəfindən bilinməyən bir hədis isə bu növ hədislər də münkər kimi qəbul edilmişdir.

*"İki müsəlman qarşılaşıb (əllə) görüşsələr (musafaha), bir-birindən ayrılmadan günahları bağışlanar."*

(Əbu Davud, Ədəb 143)

**b) Mətruk hədis**



Sənədində yalan söyləməklə təqsirləndirilən və ya gündəlik həyatında yalan danışdığı sabit olan bir ravinin olduğu hədisə Mətruk hədis deyilir.

Ravisi yalançılıqla müttəhim olduğuna görə mətruk hədislər zəif olaraq vəsifləndirilmişdir. Buna görə də dində dəlil olmaz.

**c) Müəlləl hədis**

Görünüşü etibarilə səhih olmaqla yanaşı səhhətinə zərər verəcək gizli bir qüsuru müəyyənləşdirilən hədisdir.

İlləni müəyyənləşdirmək üçün hədislərin bütün sənədlərini toplamaq, ravilərin ixtilaflarına baxmaq, zəbt və ədalət sifətlərini incələmək lazımdır. Hədisi müəlləl hala gətirən illə hədisin ya isnadında ya da mətnində olur.



### d) Müdəlləs hədis

Ravinin, şeyxindən eşitmədiyi hədisləri eşitmiş kimi rəvayət etməsi və ya hədisi aldığı ravini bilinməyən bir ad ya da ləqəb ilə anması yaxud da isnadda yer alan zəif bir ravini qeyd etmədən rəvayət etdiyi hədislərə Müdəlləs hədis deyilir.

Alimlərin əksəriyyətinə görə müdəlləs hədislər zəifdir və onunla əməl edilməz. İmam Şafe bu növ tədlis üçün: “tədlis yalanın qardaşıdır” demişdir.

Mudəlləs hədis münqəti hədisdən daha zəif sayılmışdır.

**1) Tədlisin növləri**

Tədlis üç cür meydana gəlir. Bunlara tədlisul-isnad, tədlisuş-süyux, tədlisut-təsviyə deyilir.

Tədlisul-isnad

Ravinin müasiri olduğu halda görüşmədiyi bir şeyxdən və ya görüşdüyü fəqət hədis eşitmədiyi bir şeyxdən və yaxud hədis eşitdiyi bir şeyxdən duymadığı bir hədisi duymuş kimi rəvayət etməsidir ki, buna “isnad tədlisi” deyilir.

Tədlisuş-şuyux

Bir ravinin isnadı söylərkən, şeyxini hər kəs tərəfindən tanınan adı ilə deyil, bilinməyən bir ləqəb və ya künyə ilə qeyd etməsidir.

Ravinin bu cür davranmasının məqsədi ondan ibarətdir ki, gizlətmək istədiyi şeyx ya yaşca özündən kicik və ya zəifdir yaxud da ondan çox hədis rəvayət etdiyi üçün dinləyənlərin -həmişə eyni şəxsdən rəvayət edir- fikrini ortadan qaldırmaqdır.

Tədlisut-təsviyyə

Bir şəxsin, rəvayət etdiyi hədisin isnadında olan siqa ravilər arasındakı zəif bir ravini qeyd etmədən hədisi tamam etibarlı ravilərdən almış kimi göstərməsidir. Bəzi alimlər bunu tədlisul-isnadın növü olaraq qəbul etmişdir.

**e) Şaz hədis**

Etibar edilən bir ravinin, özündən daha güvənili olan başqa ravilərə müxalif olaraq rəvayət etdiyi hədislərə şaz hədis deyilir. Belə bir vəziyyətdə, daha etibarlı ravilərin rəvayət etdikləri hədisə **məhfuz,** ona müxalif olan rəvayətə isə **şaz** deyilir.

*Hamınız çobansınız və hamınız əmri altında olanlardan cavabdehsiniz. Idarəçi məmurlarının çobanıdır. Kişi, ailəsinin çobanıdır və onlardan cavabdehdir. Qadın kişisinin evinin və uşaqlarının çobanıdır və onlardan cavabdehdir. Hamınız çobansınız və güddüklərinizdən cavabdehsiniz.*

(Buxari, Cümə 11; Müslim, İmarə 20)

**f) Müdrəc hədis**

Ravisi tərəfindən mətninə, əslində olmayan sözlər əlavə edilmiş və bu sözlər də əslindən imiş kimi göstərilən hədisdir.

İdracın səbəbləri çoxdur. Bunlardan ən çox bilinəni bunlardır:

Şəri bir hökmü açıqlamaq

Hədisi bitirmədən hədisdən hökm istinbat etmək

Hədisdəki qərib bir sözü açıqlamaq.

## V. UYDURMA HƏDİS

Ravisi tənqid edilən hədislər arasında ən dəyərsiz olanı uydurma hədisdir. Bəzi alimlər belə rəvayətlərə hədis demənin düzgün olmadığını, bəlkə də uydurulmuş söz deyilməsinin doğru olacağını ifadə etmişdir. Hədis adıyla uydurulmuş sözlər, əl-hadisul-məvzu, əl-hadisul-muxtəlaq və ya əl-hadisul-masnu terminləriylə ifadə edilməkdədir.

Zarafatda belə yalan danışma

Başda İslam dininə qarşı olanlar olmaq üzrə, mənsub olduqları siyasi firqələri, fiqhi məzhəbləri, qəbilələrini, dillərini, bölgələrini, tabe olduqları imamları tərifləmək üçün, idarəçilərin nəzərində yüksək mərtəblər qazanmaq üçün, came və məsçidlərdə moizə oxuduqları camaatı cuşə gətirmək və özlərinə yönləndirmək üçün, xalqın dinə qarşı rəğbət və təvəccöhünü artırmaq üçün, yalançıların və cahillərin uydurduqları daha sonra da bu uydurmuş sözlərin dərəcələrini yüksəltmək üçün məşhur hədis ravilərindən quraşdırdıqları isnadları əlavə edərək Hz. Peyğəmbərə (s.ə.s) iftira edilən yalan sözlərə uydurma söz, mövzu hədis deyilir.[83]

*"Kim Allah rizasını qazanmaq məqsədi ilə ailəsinin maişətini təmin edərsə, xərclədiyi hər şey onun üçün sədəqədir."*
(Buxari, İman 41; Müslim, Zəkat 49)

## A. HƏDİS UYDURMACILIĞININ TARİXİ

Yuxarıda hədislərin bir çox növlərini, xüsusiyyətlərini və İslam dini və mədəniyyəti üçün təqdim etdiyi əhəmiyyətini qeyd etməyə çalışdıq. Hədislərin bu müstəsna mövqeyi, onlardan müxtəlif məqsədlərlə istifadə etmək fikirlərini də yanında gətirmişdir. İslam cəmiyyətində kitab və sünnəyə uyğunluq məşru (islami qaydalara uyğun) olmağın əsas şərtidir. Bəzi şəxslər və ya qruplar, hədis uydura-

**OXUYUN-MÜZAKİRƏ EDİN.**

Hz. Osman şəhid edildikdən sonra müxtəlif firqələr ortaya çıxdı. Bu firqələr öz fikirlərini yaymaq üçün iki mənbəyə müraciət etdilər. Qurani-Kərim və hədislər... Onlar Qurani-Kərimi öz fikirlərinə görə izah edir, görüşlərini dəstəkləyən hədisləri yayır, görüşlərinə uyğun gəlməyən hədisləri öz fikirlərinə görə təvil edir nəhayət fikirlərinə uyğun hədis yoxdursa uydururdular...

Yuxarıdakı mətni nəzərə alaraq hədis uydurmanın səbəbləri barəsində yoldaşlarınıza müzakirə edin.

83 Tərif üçün bax. Talat Koçyiğit, *Hadis İstilahları*, s. 225.

raq bu gərəyi yerinə yetirməyə çalışmışdır. Yəni hədis uydurma təşəbbüsləri bir mənada hədisin İslam cəmiyyətindəki hakimiyyəti və dindəki yerinin etirafı deməkdir. Necə ki, qiymətli şeylər saxtalaşdırılır.

Hz. Peyğəmbər adına hədis uydurmanın tarixini dəqiq olaraq müəyyənləşdirmək çətindir. Bəziləri bunun, Hz. Peyğəmbər dövründə başladığını iddia etməkdədir. Bu iddialarına da Hz. Peyğəmbərin: (من كذب عليّ متعمدا فليتبوأ مقعده من النار) *"Kim bilə bilə mənə yalan nisbət edərsə Cəhənnəmdəki yerinə hazırlaşsın"*[84] hədisini dəlil olaraq göstərir. Onlara görə adı naməlum bir şəxs Hz. Peyğəmbərin paltarına bənzər paltar geyərək, Mədinədən iki mil uzaqda yerləşən Leys oğulları qəbiləsinə gəlir və Hz. Peyğəmbərin öna səlahiyyət verdiyini söyləyir. Bu şəxs cahiliyyət dövründə Leys qəbiləsindən bir qadınla evlənmək istəmiş, ancaq istəyinə nail ola bilməmişdi. Bu səbəblə də bu hiyləni işlədərək o qadının evinə və ya ona yaxın bir yerdə məskunlaşmışdı. Bundan şübhələnən qəbilə xalqı, hadisəni aydınlaşdırmaq üçün Hz. Peyğəmbərə bir elçi göndərirlər. Bunu eşidən Hz. Peyğəmbər qəzəblənərək "yalan söyləmiş Allahın düşməni"- deyir. Əshabından birini vəzifələndirərək, onu canlı ələ keçirsə öldürməyi, ölü olaraq taparsa yandırmağı əmr edir. Qəbiləyə gəldiklərində bu şəxsin gecə bayıra çıxanda ilanın sancdığını və öldüyünü görürlər. Bunun üzərinə də Hz. Peyğəmbər yuxarıdakı hədisi söyləyir.

*"(Hər hənsı) işdə rüşvət alan və verən (və vasitəçilik edən) kimsəyə lənət etmişdir."*
(Tirmizi, Ahkam, 9; Əbu Davud, Əqdiyyə, 4)




Bu xəbər hər nə qədər hadis uydurma fəaliyyətinin Hz. Peyğəmbər zamanında başladığını göstərsə də sistematik hədis uydurma fəaliyyətinin başlanğıcı mənasına gəlməz. Sistematik olaraq hədis uydurma fəaliyyəti hədis alimlərinin əksəriyyətinə görə Hz.Osmanın şəhid edilməsindən sonra başlamışdır. Bu hadisə nəticəsində müsəlmanlar firqələrə ayrılmış və hər firqə də özünün doğru olduğuna inanmışdır. Bu qruplardan hər biri özünün haqlı olduğunu isbatlamaq üçün ayə və hədislərdən dəlillər axtarmışdır. Bu mənbələrdən özlərinə uyğun dəlil tapa bilməyincə də Hz. Peyğəmbərin adına yalan uyduraraq ətrafındakıları özlərinə inandırmağa çalışmışdır.

Mərhum Əhməd Naimin ifadəsilə "... **küfri billahdan sonra əkbəri kəbair**" olan hədis uydurma təşəbbüslərini bir az yaxından tanıyaq.

## B. HƏDİS UYDURMANIN SƏBƏBLƏRİ

Zaman keçdikcə uydurma fəaliyyətlərinin bəzi məqsədlərə bağlı olduğu müşahidə edilir. Bu məqsədləri belə sıralamaq olar.

### a. Qrup görüşünü müdafiə etmək

Siyasi bölünmələr zamanla əqidəvi bölünmələrə də səbəb olmuşdur. Bu qruplar doğru yolda olduqlarını isbat etmək üçün fikirlərini güclü dəlillərə nisbət etmək məcburiyyətində idilər. Hədislər isə hələ rəsmən və tamamilə yazılı şəkildə

84 Buxari, Elm, 38; Müslim, İman, 112.

tədvin edilməmişdi. Buna görə də, təhrif etmək və dəyişdirmək imkanı vardı.

Qruplar əvvəlcə liderləri lehində hədis uydururdular. Həmçinin qarşı qrupların əleyhində də hədis emal etməkdən çəkinmirdilər. Bu işdə müsəlmanların düşmənlərinin rolu da danılmazdır.

Kraldan çox kralçılıq edən tərəfdarların, idarəçilərə yaltaqlanmaq və mal dövlətə sahib olmaq istəyən mənfəətpərəstlərin bu işdə böyük rolu vardır. Bundan başqa qövmiyətçilik və yerlipərəstlik hisləriylə də uydurulmuş hədislərin varlığı bir həqiqətdir.

Həddindən çox tərəfkeşlik, firqəçilik və qrupçuluq meyli, bir çox hallarda din şüurunun üstünə çıxaraq Peyğəmbərə yalan isnad edəcək dərəcədə həddini aşmışdır.

Məzhəb təəsübkeşliyinə bu uydurmanı misal olaraq göstərə bilərik:

*“Ümmətimdən Əbu Hənifə adında bir adam çıxacaqdır. O ümmətimin çırağıdır. Həmçinin ümmətimdən Məhəmməd ibn İdris adında biri çıxacaqdır. Onun ümmətə verəcəyi zərər Şeytanın zərərindən çox olacaqdır.”*[85]

### b. İslam düşmənçiliyi

Müsəlmanların birlik və bərabərliyini pozm aq, inanclarını zəiflətmək istəyən zındıqlar öz məqsədlərini gerçəkləşdirmək üçün müsəlmanların güc mənbəyi olan İslamı təhrif etmə yolunu seçdilər. Qurani-Kərim öz ecazkarlığı ilə aşılmaz qaladır. Bunu bilən İslam düşmənləri öz mənfur məqsədlərini ancaq hədisi şəriflər üzərində həyata keçirməyi özlərinə məqsəd seçdilər. Bu fəaliyyətlərini ümumiyyətlə müsəlman örtüyü altında davam etdirməyə də əhəmiyyət verirdilər. Həmmad ibn Zeyd, “Zındıqlar 14000 hədis uydurdu”-deyir. Böyük hədis alimi Şabi də “Batil firqələrin ən təhlükəli olan rafizilər, sevdikləri və ya qorxduqları üçün deyil, müsəlmanlara qarşı duyduqları kin

85 İbn Cövzi, *Mövzuat,* II, 48-49.

**MÜTALİƏ EDİN**

Günlərin birində iki böyük hədis alimi Bağdadda Rusafə məsçidinə gedirlər. Namazdan sonra kürsüyə çıxan bir qissəçi vaiz sənədində Əhməd ibn Hənbəl ilə Yəhya ibn Main adının da keçdiyi bir isnadla “ Hər kim ləiləhəilləllah deyərsə Allah bu sözün hər kəlməsindən qursağı qızıldan və tükləri mərcandan olan quş yaradar” məzmunlu hədis rəvayət edir. Bunu eşidən İmam Əhməd ilə İmam Yəhya heyrətlə bir-birinə baxır və bir-birinə sən belə hədis rəvayət etdinmi? deyə soruşurlar. Hər biri bu vaxta kimi belə hədis eşitmədiklərini ifadə edirlər. Moizəci moizəsini bitirib bəxşiş toplarkən Yəhya ibn Main əliylə onu yanına çağırdı və ona “Bu hədisi sənə kim rəvayət etdi?. Bu Əhməd ibn Hənbəl mən də Yəhya ibn Mainəm. Belə bir sözün Peyğəmbərə aid olduğu əsla eşitməmişik. Əgər mütləq yalan danışmalısansa bizim adımızı bu işə qarışdırma.” dedi. Moizəçi ona “ sən Yahya ibn Mainsən? –deyə soruşdu. Yəhya bəli deyincə moizəçi ona “ Çoxdan bəri Yəhyanın axmaq olduğunu eşitmişdim. Ancaq belə olduğunu indi daha yaxşı başa düşdüm” – deyə cavab verdi. Yəhya ona “Mənim axmaq olduğumu hardan bildin?-deyincə moizəçi “ Sanki dünyada sizdən başqa Yəhya ibn Main və Əhməd ibn Hənbəl yoxdu? Mən adı Əhməd ibn Hənbəl və Yəhya ibn Main olan on yeddi nəfərdən hədis yazdım.”-dedi. Bu gözlənilməz cavab qarşısında donub qalan Əhməd ibn Hənbəl əlləriylə üzünü bağlayaraq: “Burax getsin” –dedi. Moizəçi də istehzalı hərəkətləriylə oradan ayrıldı getti.

**Yuxarıda qeyd olunan mətni hədis uydurma səbəbləri baxımından dəyərləndirin.**

*“Bir alimin şüursuz ibadət edən kimsədən üstünlüyü, mənim sizin ən alt dərəcədəkinizə üstünlüyüm kimidir.”*

və nifrət səbəbi ilə, onlara pislik etmək üçün İslamı qəbul etmişdilər.”-deyir. Bunlar hec bir ölçü tanımadan hədis uydurmuşlar. “Mən nəbilərin sonuncusuyam. Allahın dilədiyi xaric, məndən sonra nəbi yoxdur”, “Rəbbini Minada boz bir dəvəyə minmiş halda gördüm..” kimi sözlər bu yalançılığın hansı dərəcəyə çatdığını göstərir.

Onu da qeyd etmək lazımdır ki, bu İslam düşmənləri rəsmi və elmi təqib nəticəsində düşündüklərini istədikləri səviyyədə həyata keçirə bilməmişdirlər. Çünki bunlar İslam düşməni olaraq tanınırdılar.

**c. İslama xidmət etmə arzusu**

Qəribədir ki, müsəlmanları yaxşı əməllərə sövq edib pis əməllərdən çəkindirmək məqsədi ilə də hədis uyduranlar olmuşdur. Hətta bu yolla Allahın rızasını qazanmağı umanlar da olmuşdur.




Bu düşüncə ilə hədis uyduranlar din üçün ən təhlükəli olanlarıdır. Çünki bunlar xalqın sevdiyi və örnək aldığı şəxsiyyətlərdir. Onların hədis deyə tanıtdıqları sözlər tərəddüdsüz hədis olaraq qəbul ediləcək və bunun əksini ağıllarına belə gətirməyəcəklərdi. Buna görə də onlar ən azı dinə zərər vermək istəyənlər qədər zərərli olmuşlar.

*“Şübhəsiz Allah, mələklər, yer və səma əhli, hətta yuvasındakı qarışqa və dənizlərdəki balıqlara qədər bütün məxluqat müəllimlərə (insanlara xeyir və şərri öyrədənlərə) dua edərlər.”*

(Tirmizi, Elm 19)

Bu arada lehine hədis uydurmağı caiz görən bir anlayışdan da bəhs etmək lazımdır. Lehdə hədis uydurmağı caiz görənlər, hədis uydurmağı qadağan edən hədisdəki “aleyyə” kəlməsini “əleyhimdə”-deyə açıqlayıb lehində uyduranların bu qadağanın əhatəsinə girməyəcəyini iddia edirlər. Düşüncə və məqsədləri nə olursa olsun, hədis uydurmağa cəvaz verənlər, fərz və ya məndub, haram və ya məkruh bölümlərindən birinə aid şəri bir hökmü Hz Peyğəmbərə isnad edərkən nəticə etibarilə Allaha qarşı yalan söyləmiş olurlar.

Məsələn Qurani-Kərimin hər surəsini oxumağın başqa bir savaba vəsilə olacağını bildirən bir çox uydurma hədislər arasında yer alır. Bunlardan biri belədir: *Hz. Peyğəmbər Übey ibn Kaba xitab edərək belə demişdir: Ey Übey hər kim Fatihə surəsini oxuyarsa ona bu qədər savab verilər. Quranı sonuna qədər sırayla hər surənin fəziləti ilə əlaqəli eyni şeylər söyləmişdir.”*[86]

Burdan da görünür ki, Allah üçün hədis uyduranlar və bunun qarşılığında savab gözləyənlər bu işin pis bir əməl olduğunu düşünmürlər. Hər nə qədər etdikləri iş xeyirli kimi görünsə də İslam adına xeyirli və xeyrinə deyil.

**d. Şəxsi mənfəət təmin etmə düşüncəsi**

Bəzi insanlar camaatdan mənfəət təmin etmək üçün onların xoşlarına gələcək hədislər uydurmuşdur. Xüsusən moizəçilər camaatı məmnun etmək üçün və onlardan daha çox vəsait ala bilmək üçün həmçinin onların gözündə etibarlarını

---

86 İbn Cövzi, *Mövzuat,* II, 123-124.

artırmaq üçün məntiqə zidd hədislər uydurmuşdur. Bazardakı bəzi maddi malların qiymətlərini artırmaq üçün yalandan hədis uyduranlar və xalq arasında hörmətli bir alim qəbul edilmək üçün verdiyi fitvaları, uydurma hədisləri qəbul edənlər də mənfəətçilər arasında zikr edilməlidir.

## C. HƏDİS UYDURMA ÜSULLARI




Uydurulmuş hədis dedikdə ilk ağıla gələn hədisin formasının tam olaraq uydurulmuş olmasıdır. Ancaq bu iş hər zaman belə olmamışdır. Daha doğrusu hədis uydurmaqla məşğul olanlar çox açıq bir şəkildə hədis uydurmağa cəsarət edə bilməmişdir. Onların hər biri fərqli yol və metodla xəyanətlərini həyata keçirmişdir. Bu yolları belə xülasə etmək mümkündür.

**1.Uydurmaları səhih hədislərlə qarışdırmaq**

Peyğəmbərimiz, müharibəyə gedərkən Mədinədə nəzarətçi olaraq saxladığı Hz. Əliyə: "*Musaya görə Harun nə isə, mənə görədə sən osan"*[87]-deyə buyurduğu səhih hədisin başına, *"Mədinə ikimizdən birimizin olmadığı müddətcə düzəlməz"* qismini hədis uydurmaq ilə məşğul olan Həfs ibn Ömər ibn Dinar əl-İli əlavə etmişdir.

**2. Uydurulan sözün başına mötəbər sənəd əlavə etmək**

Bu metodu həyata keçirmək üçün gecələri yatmadan hədis uyduran kimsələr ortaya çıxmışdır. Hədis mütəxəssisləri bu cür saxtakarlıqları bir-bir müəyyənləşdirərək *"bu söz bu sənədə yamanmışdır"* kimi ifadələrlə vəziyyəti açıqlamışlar.

**3. Sənədlərindən hər hansı biri üzərində dəyişiklik etmək**

Sənəddə yer alan bir yalançının adını çıxarmaq, sənəddəki ravilərdən birinin yerinə öz adını yazmaq, özünü görüb danışmadığı birindən hədis öyrəndiyini iddia etmək, bu cür uydurmaları həyata keçirmə yollarıdır.

**4. İki hədisin sənəd və mətinlərini bir-birinə qarışdırmaq**

## D. UYDURMA HƏDİSLƏRİ TANIMA YOLLARI

**a. Ləfiz və ya mənadakı pozuqluq**

Hədis deyə ortaya atılan sözün leksik qaydalara uyğun olmadığı, möhtəvasının Peyğəmbər sözü və kəlamına uyğun olmaması o sözün uydurma olduğuna işarə edir. Belə ki, Hz Peyğəmbər "Əfsahul-ərəb" ərəblərin ən gözəl danışanı idi.

Tərğib və tərhib üçün hədis uyduranların, hədisi həddindən artıq şişirtmələri və zındıqların gülmələrinə səbəb olacaq sözləri də, bu qrupa daxildir. Məsələn: *"Yaşıllığa və gözəl qadına baxmaq görmə qabiliyyətini artırar"* uydurması kimi...

87 Buxari, Fəzail əl-əshab, 9.

*"Kim elm öyrənmək üçün yola çıxarsa, Allah o şəxsə cənnətə gedən yolları asanlaşdırar."*

(Müslim, Zikr 39)

Az əmələ görə çoxlu savab vəd edən və ya kiçik bir günaha görə şiddətli cəzalarla qorxutmaq, məna etibarilə pozuq və ölçüsüz olduğu üçün bunlar uydurma hədis olaraq qəbul edilir. Uydurulmuş sözlər ləfzdəki xətalardan daha çox, mənadakı səhv ifadə tərzinə görə təsbit edilərək şərh edilmişdir.

**b. Mötəbər hədis kitablarında yer almamaq**

Belə hədislər günümüzdəki mötəbər hədis kitablarında olmadığı üçün uydurma olduğuna dair dəlil qəbul edilir. Belə ki, Süyuti demişdir: *"Hədis kitablarında yer almayan, həm də müttəsil bir sənədi olmayan hədislərə bəzi moizə, təfsir, siyər və tarix kitablarında rast gəlirik... İlk dövrlərdəki hədis imamları zamanında mövcud olmayan bu sözlərin bir çoxu sonrakı dövrlərdə uydurulmuşdur"*.

**c. Qurana və səhih sünnəyə zidd olmaq**

Hədis adıyla meydana atılan sözlərin Qurana və səhih sünnəyə zidd olması onların uydurma olduğunu göstərir. *"Dünyanın ömrü yeddi min ildir, biz yeddinci minilliyin içindəyik"* qoşması Qurana ziddir. Çünki Quranda Allah: **"Səndən qiyamətin nə zaman qopacağını soruşurlar. De ki, onun zamanını yalnız Allah bilir"**[88]-deyə buyurmuşdur. Hz Peyğəmbər də *"Mən qeybi bilmərəm"*-deyə buyurmuşdur. Həmçinin hədis səhih olsaydı hicrətin ilk illərində qiyamət qopmalı idi. O halda zikr etdiyimiz bu xəbər Qurana və sünnəyə zidd olduğu üçün uydurmadır.

**d. Ağıla, hissiyata, müşahidəyə və tarixi hadisələrə zidd olmaq**

"Hicrətin 600-cü ilindən sonra dünyaya gələn varlıqlara Allahın heç bir ehtiyacı yoxdur" uydurması ağıla, məntiqə və tarixi həqiqətlərə ziddir. Çünki, o tarixdən sonra yaşayan insanlar arasında İslama və insanlara həqiqətən qiymətli xidmətlər edən insanların sayı hesabı yoxdur.

**MÜTALİƏ EDİN**

Aşağıdakı hadisəni "tarixi hadislərə zidd olma" baxımından dəyərləndirin.

"Soyuqdan çəkinin. Çünki qardaşınız Əbu Dərdanı soyuq öldürmüşdür." Uydurması tarixi həqiqətə ziddir. Çünki Əbu Dərdə Hz. Peyğəmbərin (s.ə.s) vəfatından 22 il sonra yəni hicrətin 32-ci ilində vəfat etmişdir.

*"Rüşvət alan da verən də atəşdədir."*
(Əbu Davud, Əqdiyə 4)

## E. UYDURMA HƏDİSLƏRİN ZƏRƏRLƏRİ

Məqsədindən asılı olmayaraq hədis deyə uydurulub meydana atılan sözlərin İslama və müsəlmanlara böyük zərərləri vardır. Bunlardan bir neçəsini izah edək.

**a. İslamı doğru anlamağa mane olmaq**

Hz. Peyğəmbər bir yandan Quranı təbliğ etmiş bir yandan da onu lazımi şəkildə izah etmişdir. Yaşayış tərzi ilə ümmətinə nümunə olmuşdur. Rəsulullahın sözlərini və ya fellərini öyrənmək İslamı tanımaq deməkdir. Bu mövzuda uydurma olaraq ortaya atılan sözlər İslamı və onun təbliğçisi olan Hz. Peyğəmbəri anlamağa manedir. Xüsusilə də bütün sünnəyə qarşı o insanda şübhə yaradır.

---

88 Naziat, 79/42-44.

**b. Dini təhrif etmək**

Ən son və ən mükəmməl din olan İslama, onda olmayan bəzi ünsürləri əlavə etmək ya da bəzi xüsusları ondan çıxarmaq bu dini təhrif etməkdir. Yaxşı bilmək lazımdır ki, İslamın heç kimin əlavəsinə və yalanına ehtiyacı yoxdur.

**c. Ayrılığı körükləmək**

Müsəlmanlar arasında ayrılıq yaratmaq və müsəlmanları müxtəlif yollarla bir-birinə düşmən edən həmişə belə uydurma sözlərdir. Qrupçuluq, partizanlıq, qövmiyyətçilik duyğularını körükləyən uydurmalar Muhamməd ümmətinin birliyinə zərər vermiş və zərər verməyə davam etməkdədir.

**d. Dindən soyutmaq**

Müjdə və ya təhdid qüvvəsi yüksək və ölçüsüz olan uydurmalar ya dini əmrləri ehmal etmiş ya da dindən uzaqlaşmağa səbəb olmuşdur. Batil inancların və xürafələrin cəmiyyətdə özünə yer tapmasının əsas səbəbi də bu uydurma sözlərdir.



Əli əl-Qarinin uydurma hədisləri cəm etdiyi və *Mövzuat əl-kübra* adı ilə məşhur olan *əl-Əsrarul-mərfua fil əxbaril-mövzua adlı əsəri*

## F. HƏDİS UYDURMAĞIN HÖKMÜ

Hz. Peyğəmbərin adından istifadə edərək yalan hədis uydurmaq haramdır. Hətta bu haramların ən pisidir. Çünki, *"Kim mənə nisbət edərək yalan uydursa cəhənnəmdəki yerini hazırlasın"*[89]-hədisi bu vəziyyəti çox açıq bir şəkildə ifadə edir. Yalan onsuzda haramdır. Qaldı ki, bu haram Hz. Peyğəmbərə nisbət edilərək söylənsin.

Uydurma olduğunu bildiyi halda onu rəvayət edən, uydurma olduğunu da bəyan etməyən insan da ən böyük günahlardan birini işləmiş olar. O insanda yalançıdır. Bir insan hədisi uydurma olduğunu bilmədən nəql etsə, günah işləmiş olmaz. Ancaq, çox əhəmiyyət kəsb edən bu mövzu haqqında diqqətli olmadığı üçün çox böyük qüsur etmiş olar.

Uydurma hədisləri, müsəlmanları uzaqlaşdırmaq, dini təhrifdən qorumaq məqsədilə izah etmək və ya öyrətmək məqsədilə nəql edən insanın savab işlədiyi ehtimal olunur. Çünki, müsəlmanların bu mövzuda maariflənməsinə ehtiyacları vardır.

Əvvəllər hədis elmində hədisi söyləyərkən, onun sənədini zikr etmək lazım idi. Ancaq Səxavinin də haqlı olaraq bildirdiyi kimi "dövrümüzdə bir şəxs hədisin sənədini verməklə onun vəziyyətini açıqlamaq borcundan qurtula bilməz. Çünki indi sənəddən hədisin uydurma olduğunu anlayan şəxs çox azdır".

*"Əhdə vəfasızlıq edən hər kəs üçün qiyamət günü bir bayraq sancılacaq və bu filankəsin bayrağıdır deyə elan ediləcəkdir."*

(Buxari, Cizyə 22; Ədəb 99; Müslim, Cihad 17)

89 Buxari, Elm 8.

## G. HƏDİS UYDURMA TƏŞƏBBÜSLƏRİNƏ QARŞI ALINAN ELMİ TƏDBİRLƏR

İslamın təbliği vəzifəsini Hz. Peyğəmbərdən almış olan "peyğəmbər varisi alimlər" bunlar arasında da xüsusi yer tutan mühəddislər, hədislərin istismarına imkan verməyəcək elmi tədbirləri almaqda səhvə və nöqsana yol vermədilər. Onların aldıqları bu tədbirlər də hədis elminin bir çox qolunun ilkin dövürdə inkişaf etməsinə və sünnətin təbiiliyinin qorunmasına səbəb oldu. İndi də qısa olaraq bu tədbirləri görək.



**QEYD EDİN**

Uydurma hədislərlə əlaqəli yazılan ən dəyərli və əhatəli əsərlərdən biri də İbn Ərraqın *Tənzihuş-şəriətil-mövdua anıl-əhadisi şəniatil-mövdua* adlı əsəridir.

*"Mən qiyamət günü bu üç qrup insanın düşməniyəm:*

- *Mənim adıma and içdikdən sonra sözündən dönən,*
- *Hür bir insanı kölə deyərək satıb pulunu yeyən,*
- *İşçi işlətdikdən sonra pulunu verməyən şəxs."*

(Buxari, Buyu 106; İcarə 10)

### 1. Səhih hədisləri müstəqil əsərlərdə toplamaq

Hədis üsulu ölçülərinə görə sağlam sənədlərlə ümmətə ötürülmüş, Hz. Peyğəmbərə aid olmasında tərəddüd olmayan hədisləri xüsusi kitablarda birləşdirmək, uydurmaların tanınılmasında və ayrılmasında ilk elmi tədbir olaraq mənimsənilmişdir. Yuxarıda mötəbər hədis kitablarında olmayanı, uydurmaları tanıma yollarından biri olaraq bildirmişdik.

Səhih, həsən və zəif hədisləri əhatə edən əsərlər də yenə uydurma hədislərə qarşı alınmış dərəcə-dərəcə olan elmi nəaliyyətlərdir.

### 2. Hədis tənqidi prosesinin tətbiq olunması

İslam alimləri, istinad sistemi tətbiqi nəticəsində həm sənəd, həm də mətn tənqidini böyük bir incəliklə həyata keçirmiş və bununla əlaqəli elmi qollar meydana gətirmişlər. Bu arada səhabə nəslindən etibarən böyük cərh və tədil ustadları yetişmiş, bunların rəvayətinə sahib olduqları şəxsləri təqib etmiş, araşdırmış, etibar olunmalarını açıqlamış və sübut etmişdir.

Cərh və tədil elmi müstəqil bir elm qolu olmuşdur. Ravini izah edərkən bu kitabda cərh və tədil əsaslarına, qaynaqlarına işarə edilmişdir.

### 3. Raviləri tanıdan əsərlər yazmaq

Hədis rəvayət edən raviləri tam mənası ilə tanıtmaq məqsədi ilə biyoqrafiya (tərcümeyi-hal), təbəqət, tarix və vəfayat kitabları yazılmışdır. Ayrıca cərh və tədil vəziyyətlərinə görə ayrı adlarla bilinən ravi qurupları üçün müstəqil və ya qarışıq əsərlər yazılmışdır. Müəyyən bölgələrdə yetişmiş alimlər üçün də bölgə və şəhər tarixləri ilə əlaqəli əsərlər yazılmışdır. Bu əsərlər də hədis rəvayəti ilə məşğul olan ravilərin vəziyyətlərini müəyyənləşdirir.[90]

90 Lütfi Çakan *Hədis Üsulu* s. 153-164.

## ÜÇÜNCÜ FƏSLƏ AİD SUALLAR

1. Hökm baxımından hədis növlərini sadalayın
2. Səhih hədisin xüsusiyyətlərini açıqlayın..
3. Mövzu hədislərin yaranma səbəbləri nələrdir?
4. Zəif hədislə əməl etmə barəsində fikirləri sıralayın
5. Mövzu hədislərin zərərlərini izah edin.
6. Qüdsi hədis ilə Qurani-Kərim arasındakı fərqləri sadalayın.

### Test sualları

**1. Aşağıdakı hədis növlərindən hansı növ söz fel və təqrir baxımından peyğəmbərə aid hədis növüdür?**

a) Məqtu hədis
b) Mövzu hədis
c) Qüdsi hədis
d) Mövquf hədis
e) Mərfu hədis

**2. Aşağıdakılardan hansı hədisin mənası Allaha ləfzi isə Peyğəmbərə aiddir?**

a) Mətruk hədis
b) Mütəvatir hədis
c) Nəbəvi hədis
d) Qüdsi hədis
e) Mərfu hədis

**3. Aşağıdakılardan hansı zəif hədis növü deyildir?**

a) Mudal hədis
b) Mürsəl hədis
c) Şaz hədis
d) Həsən hədis
e) Müəlləq hədis

**4. Səhabənin keçmiş peyğəmbərlərə, cənnət və cəhənnəmə və yaxud ibadətlərlə əlaqəli rəvayətlərinə nə deyilir?**

a) Mövquf hədis
b) Məqtu hədis
c) Hökmən Mərfu
d) Uydurma hədis
e) Açıq mərfu

**Boşluqları doldurun**

1. Söz fel və təqrir olaraq səhabəyə aid hədisə .................. deyilir.
2. Mütəvatir hədis şərtlərini daşımayan hədisə..............deyilir.
3. Əli əl-Qarinin uydurma hədislər dair yazdığı əsərin adı...................

## DÖRDÜNCÜ FƏSİL

## HƏDİSLƏRİ ANLAMAQ

### HAZIRLIQ TAPŞIRIQLARI

1. Qəribul-hədis və müxtələful-hədis terminlərinin mənasını dini terminlər lüğətindən araşdırın.
2. Gündəlik istifadə edilən hər hansı bir hədisi müəyyənləşdirin və bu hədisin nə məqsədlə söyləndiyi barəsində düşünün
3. “Örnək almaq və təqlid etmək” ifadələri arasındakı fərqlər barəsində düşünün

## I. SÜNNƏ VƏ HƏDİSLƏRİ ANLAMADA KÖMƏKÇİ HƏDİS FƏNNLƏR



İslamı doğru anlayıb izah etmək üçün hədis və sünnənin müstəsna yeri vardır. Qurani-kərimi anlamaq üçün bəzi əsasların olduğu kimi hədisləri anlamada da bəzi əsas və metodlar vardır. Hədisləri anlama əsası üzərinə qurulan bəzi hədis elmləri vardır. Bu elmlərin əsas məqsədi mətnlərdə keçən kəlmələrin mənalarını və hədisdəki əsas mesajları müəyyənləşdirməkdir.

Hz. Peyğəmbərin kəlam və tətbiqatlarını düzgün analiz etmək üçün o dövrün tarixi və mədəni mühit haqqında məlumata sahib olmaq labüddür. Çünki zaman və makana görə ictimai həyat, mədəni ünsürlər ilə siyasi və iqtisadi sistemlər sözün əsl mənasında dəyişikliyə məruz qalır. Odur ki, o dövrdə etibarlı olan ancaq günümüzdə bəlli olmayan mövzu ilə əlaqəli hədisin hansı məqsədə görə söyləndiyini anlamaq üçün bəzi elmlərdən istifadə etməliyik. Məhz hədislərin məna və məqsədini əsas götürən "qəribul-hədis, muxtəliful-hədis, fiqhul-hədis və əsbabu vurudil-hədis" elmlərini tədqiq etmək hədis və sünnəni anlamada bütün müsəlmanlar üçün rəhbərdir.

### 1. Qəribul-hədis elmi



Hz. Peyğəmbər Ərəbistanın fərqli bölgələrindən gələn və müxtəlif ləhcələrdə danışan insanlara İslam dinini təbliğ edərkən Ərəb dilinin bütün ədəbi incəliklərindən istifadə etmişdir. Söhbət əsnasında istifadə etdiyi bəzi kəlmə və məsəlləri səhabə anlamayınca onları izah edib açıqlayırdı. Ancaq Hz. Peyğəmbərin vəfatından sonra hədis mətinlərindəki izaha möhtac kəlmələrin sayı artmağa başladı. Çünki İslam dini geniş coğrafiyaya yayılmış, fərqli dil və ləhçələrdə danışan insanlar Müsəlman olmuş, mənası başa düşülməyən kəlmələrin izahına ehtiyac artmışdı. İzah ediləcək kəlmələr şəxslərə görə fərqli mənalar ifadə edildi. Məsələn, Ərəb olan ilə Ərəb olmayan arasında və yaxud da Hz. Peyğəmbərin dövründə yaşayan ilə sonrakı dövrdə yaşayan insanlar arasında, hədisdə keçən hər hansı kəlməni anlamada fərqlilik vardı. Hədis mətinlərin izah edilməyə başlanması ilə bərabər başa düşülməsi çətin olan kəlmə və ifadələr o dövrün ehtiyacına görə açıqlanaraq izah edilmişdir. Hədislərdə keçən bu cür çətin başa düşülən ifadələri rahat anlamaq üçün müxtəlif elmi çalışmalara başlandı. Məhz kəlmə açıqlması mənasına gələn "Qəribul-hədis" elmi də bu çalışmanın meyvəsidir.

Hicrətin ikinci əsrindən etibarən bu sahə ilə əlaqəli müstəqil əsərlər qələmə alınmağa başlandı. Qəribul-hədis əsərlərində hədislərdə istifadə edilən və başa

*"Çirkin sözlər söyləmədən kiçik və böyük günah işləmədən həcci yerinə yetirən kimsə, doğulduğu gündəki kimi günahsız olaraq evinə dönər."*

(Buxari, Həcc 4; Müslim, Həcc 438)

**QEYD EDİN**

- Qəribul-hədis sahəsində yazılmış əsərlərdən bəziləri aşağıdakılardır.
- Əbu Ubeydə *Qəribul-hədis*
- Zəməxşəri *əl-Faiq fi qəribil-hədis*
- İbnul-Əsir əl-Cəzəri *ən-Nihayə fi qəribil hədis*

düşülməyən kəlmələr müəyyənləşdirilərək izah edilmişdir. İzahı verilən kəlmənin lüğət mənası ilə yanaşı bu kəlmənin Ərəb dili və ədəbiyyatındakı istifadə formasına da yer verilmişdir. Beləliklə o kəlmənin fərqli mənaları qeyd edilərək hədisdə hansı məqsədlə istifadə edildiyinə işarə edilmişdir. Məsələn, bu sahədə əsər qələmə alan Xəttabi hədislərdə keçən qərib kəlmələri toplayaraq lüğət mənalarını qeyd etdikdən sonra o kəlmənin istifadə edildiyi hədisi bütün incəlikləri ilə anlatmışdır. Hətta digər hədislərdə və Qurani-kərimdəki istifadəsini də diqqətə alaraq Hz. Peyğəmbərin o kəlməni hansı mənada istifadə etdiyini müəyyənləşdirməyə çalışmışdır.

Hədislərdə istifadə edilmiş qərib kəlməyə və onun izahına bu nümunəni göstərə bilərik: Hz. Peyğəmbər sarı libaslı qadın görüncə ona "gözəl olmuş" mənasına gələn "سنة سنة" kəlmələrindən istifadə etmişdir. Bu kəlmə Həbəş dilindədir. Ərəb dilində isə belə ifadələrin "حسنة" kəlməsi ilə ifadə edildiyini qəribul-hədis kitabları açıqlamışdır.

*"İki göz var ki, onlara cəhənnəm atəşi toxunmaz. Gecələr Allahın qorxusundan ağlayan göz və Gecələr Allah üçün (düşmənə qarşı) keşik çəkən göz."*

(Tirmizi, Fəzail əl-Əmal, 12)

**2. Müxtəliful-hədis elmi**

Müxtəliful-hədis elmi, bir-birlərinə zidd məna və hökm ifadə edən hədislərlə mənaları bir-birinə zidd olmadığı halda zahirən zidd görünən hədisləri incələyən elmdir.



İnsanların ən xeyirlisi onlara faydalı olandır.

Peyğəmbərimizə (s.ə.s) aid olduğu müəyyən edilən (səhih) hədislər içərisində bir-birinə zidd məna və hökm daşıyan hədislər yoxdur. Bir-birindən fərqli mənalara gələn hədislər vardır. Təzadlıq ilə fərqlilik eyni şeylər deyildir. Məsələn, Rəsulullah (s.ə.s), bir gün özünə "*Hansı əməl daha fəzilətlidir*?"-deyə soruşulduqda; "*Allaha və Rəsuluna imandır"* buyurmuşdur.[91] Başqa gündə başqa səhabə eyni sualı soruşduqda Rəsulullah (s.ə.s), ən fəzilətli əməlin, vaxtında qılınan namaz olduğunu söyləmişdir.[92] Diqqət edilərsə bu iki hədisin mənaları və göstərdikləri hökmlər bir-birindən fərqlidir. Ancaq bu fərqlilik bir təzad deyildir. Bu cür hədislərdə sual soruşan adamın halı, vəziyyəti, sualı soruşduğu zaman və məkan çox vacibdir. İlk hədis, İslamın ilk dövrlərində, ikinci hədis isə daha sonrakı günlərdə söylənmiş ola bilər. Çünki İslam dininin təbliğ edilməyə başlandığı ilk dövrdə ən əhəmiyyətli xüsus, Allaha və Rəsuluna iman etməkdir; Çünki iman olmadan ibadət olmaz. Bundan başqa namaz da o dövrdə hələ fərz qılınmamışdı. Daha sonralar isə imanın əhəmiyyəti tam olaraq başa düşülüb qəbul edilincə, Allaha və Rəsuluna iman etmiş olan

91 Tac, I, 32.
92 Müslim, İman, 137.

bir adamın edəcəyi ən əhəmiyyətli ibadət, namazı vaxtında qılmaqdır. Başqa bir sözlə iki hədis arasında hər hansı bir təzad yoxdur.

Hədislərdə müşahidə edilən ixtilafların əksəriyyəti onu rəvayət edən ravilərdən qaynaqlanır. Çünki ravilər də insan olduğuna görə xəta edib yanılırlar. Odur ki, ravi bir hədisi əksik eşitmiş və yaxud da əksik rəvayət etmiş hətta özündən bəzi əlavələr etmiş ola bilər. Həmçinin rəvayətlərin əksəriyyəti ləfzən deyil mənən rəvayət edilmişdir. Bu vəziyyətdə ravinin hədisi yanlış və əksik anlaması və yaxud da Peyğəmbərin (s.ə.s) məqsədini düzgün qavramaması mümkündür. Hz. Peyğəmbərin hərdən məcazlardan istifadə etdiyini də unutmamaq lazımdır. Bu məcazların hər kəsin eyni şəkildə anlaması mümkün deyildir.

İslam alimləri hədislərdə müşahidə edilən ixtilaflı məsələləri həll etmək üçün aşağıdakı metodlara müraciət etmişdir:

**a. Hədislərin seçilməsi**

Hədislərin seçilməsi, məna və hökm baxımından bir-birinə ziddi olan və araları uzlaşmayan iki hədisdən birini seçib digərini tərk etməkdir.

**QEYD EDİN**

Bir-birinə zidd olan hədislərdən biri Hz. Peyğəmbərə aid olmaya bilər. Əgər bir-birinə zidd olan hədislərdən biri Qurana, səhih hədisə, tarixi hadisələrə və yaxud da ağıl məntiq qaydalarından hər hansı birinə tərsdirsə bu hədislərin arasını uzlaşdırmağa səy göstərilməz və o hədis səhih qəbul edilmir.

Bu məsələ hədis elminin əhəmiyyətli mövzularından biridir. Çünki belə iki hədislə qarşılaşdığı zaman bunların nasix və mənsux olanlarını müəyyən etmək lazımdır. Əgər hədislər nasix ya da mənsux deyilsə onların arasında ziddiyyətin olmadığını müəyyənləşdirmək lazımdır. Bu mümkün deyilsə iki hədisdən biri seçilir. Bu seçilmə əsnasında hədislərin bəzi xüsusiyyətləri diqqətə alınır və bunlara **seçilmə səbəbləri** deyilir.

*"Allah Təala mənə: "O qədər təvazökar olun ki, heç kim başqasına qarşı təkəbbürlənməsin, heç kim başqasına zülm etməsin"- deyə vəhy etdi."*
(Müslim, Cənnət. 64)

Hədislər arasındakı seçilmə səbəbləri bunlardır:

**1. Raviyə görə seçilmə səbəbləri**

Hədislərin ravi vəziyyətinə görə seçilməsi bu əsaslar daxilində aparılır:

a. Çox ravi tərəfindən rəvayət edilən, az ravi tərəfindən rəvayət ediləndən üstün tutulur.

b. Ali isnadla rəvayət edilmiş hədis, nazil isnadla rəvayət ediləndən üstün tutulur,

c. Fəqih (fiqh elmində üstün bilik sahibi) ravilərin rəvayət etdiyi hədis, fəqih olmayan ravilər tərəfindən rəvayət edilən hədisdən üstün tutulur.

d. Hədisi əzbərləyən ravinin rəvayət etdiyi hədis, əzbərləməyib yazan ravinin hədisindən üstün tutulur.

**2. Rəvayət şəklinə görə seçilmə**

Rəvayət şəklinə görə seçilmə, bu prinsiplərə görə edilir:

Həm ləfzi həm də mənası ilə rəvayət edilən hədis, sadəcə mənasıyla rəvayət edilən hədisdən üstün tutulur.

Vürud səbəbi göstərilərək rəvayət edilmiş hədis, vürud səbəbi göstərilmədən rəvayət edilən hədisdən üstün tutulur.



Zalımların etdikləri əməllərdən Allahın xəbərsiz olduğunu sanma ...” (İbrahim, 14/42)

Bütün ravilərə görə mərfu olaraq rəvayət edilən hədis, ravilərin çoxu tərəfindən mərfu olaraq rəvayət edilən hədisdən üstün tutulur.

Rəvayət şəkli ixtilafsız olan hədis, ixtilaflı olandan (fərqli-fərqli rəvayət ediləndən) üstün tutulur.

Ravinin hədisi bilavasitə aldığına dəlalət edən حدثني (Mənə, hədis olaraq söylədi.), سمعت (eşitdim) kimi ləfzlərlə rəvayət edilən hədis, başqa ləfzlərlə rəvayət ediləndən üstün tutulur.

*“Qulun Rəbbinə ən yaxın olduğu hal səcdə halıdır. Odur ki, səcdədə çoxlu dua edin!”*

(Müslim, Salat 215)

**3. Vürud zamanına görə seçilmə**

Hədisin vürud zamanına görə seçilməsi aşağıdakı prinsiplərə görə edilir:

a) Mədəni (hicrətdən sonra) varid olan hədis, Məkki (hicrətdən əvvəl) varid olandan üstün tutulur.

b) Peyğəmbərimizin vəfatına yaxın varid olan hədis, daha əvvəl varid olandan ya da vürud zamanı bilinməyəndən üstün tutulur.

c) Çətinlik bildirən hədis, asanlıq bildirən hədisdən üstün tutulur.

**4. Hədisin ləfzinə görə seçilmə**

Hədisin ləfzinə, yəni mətninə görə seçilməsi aşağıdakı kimi edilir:

a) Ləfzi xas (xüsusi hökm ifadə edən) hədis, ləfzi ümum (ümumi hökm ifadə edən) hədisdən üstün tutulur

b) Ləfzi həqiqət olan hədis, ləfzi məcaz olan hədisdən üstün tutulur

c) Mənası açıq və dəqiq olan hədis, mənası açıq və dəqiq olmayan hədisdən üstün tutulur.

**5. Daşıdığı hökmə görə seçilmə**

Hədisin hökmünə görə seçilməsi, bu əsaslar daxilində edilir:

Bir şeyin haram olduğunu bildirən hədis, o şeyin mübah olduğunu bildirəndən üstün tutulur.

Bir mövzuda yeni bir hökm gətirən hədis, o mövzudakı köhnə adəti ifadə edən hədisdən üstün tutulur.



Yaradılanı yaradandan ötrü sevmək. (Yunus Əmrə)

**6. Digər səbəblərə görə seçilmə**

Hədislər arasında, göstərdiyimiz səbəblərdən başqa bu səbəblərə görə də seçilir:

Qurani-Kərimin zahiri (açıq) mənasına uyğun olan hədis, uyğun olmayandan üstün tutulur.

Eyni mövzudakı başqa hədislərlə dəstəklənmiş olan hədis, dəstəklənməmiş, yəni o mövzuda tək qalmış olandan üstün tutulur.

Rəşidi xəlifələrin tətbiq etdikləri hədis, onların tətbiq etmədikləri hədisdən üstün tutulur.

**A. ƏSBABU-VÜRUD ELMİ**



Hədislərin söylənmə yaxud da meydana gəlmə səbəblərindən bəhs edən elm sahəsinə `əsbabı vürud elmi` deyilir. Quran elmləri üçün əsbabu nüzulun yeri və əhəmiyyəti nə isə hədis elmləri üçün də əsbabu vürud elminin o dərəcə əhəmiyyəti vardır. Hədislərin bir qismi bəzi hadisələr üzərinə, bir qismi də soruşulan suallara cavab mahiyyətində varid olmuşdur.

Hz. Peyğəmbərin bir mövzuya aid söz və əməllərinin məqsədini düzgün anlamaq üçün onların söylənmə və edilmə səbəblərini bilmək lazımdır. Çünki Rəsulullah (s.ə.s) tarixi və ictimai şərtləri diqqətə alaraq hərəkət etmişdir. Buna görə hədislərin söylənmə səbəbləri, söylənmə zaman və məkanı önəm kəsb edir. Bir hədisin söylənmə səbəbinə diqqət edilmədən izah edilməyə cəhd edilərsə o hədisin əsas məqsədinə uyğun nəticələr əldə etmək çətindir. Bunun ən açıq nümunəsi cümə günü qusul alınması ilə əlaqəli hədisin izahlarıdır. Bəzi alimlər bu hədisə əsaslanaraq cümə günü qusul almanın fərz olub-olmaması barəsində mübahisələr aparmışdır. Ancaq bu mövzu ilə əlaqəli digər rəvayətlərin tamamı tədqiq edilərək səbəbi vürudu diqqətə aldıqda bu hədisin təmizliyin məqsədinə aid tövsiyyə xarakteri daşıdığını görərik. Əbu Səid əl-Xudrinin rəvayət etdiyi bir rəvayətdə Hz. Peyğəmbər belə buyurur: *"Cümə günü qusul almaq yetkinlik çağına çatan hər kəsə vacibdir"*. Bu hədisin vürud səbəbini diqqətə almadan sadəcə ləfizlərinə bağlı qalmaq düzgün deyil. Çünki Hz. Peyğəmbər insanların namaz vaxtı girincə bağ-bağçadan qalxıb cümə namazına gəldiklərini gördü. Havanın isti olması və geyindikləri paltarların da pis qoxması ətrafındakı insanları narahat edirdi. Məhz bu səbəbə görə Hz. Peyğəmbər insanlara yuyunmağı tövsiyyə etmişdi.[93]

*"Söz və davranışlarında həddi aşanlar həlak oldular."*

(Müslim, Elm 7)

93 Mehmet Emin Özafşar, *Hadisi Yeniden Düşünmek*, s. 280-281.



Bir hədisin nə məqsədlə söyləndiyi o hədisi rəvayət edən səhabənin vürüd səbəbini söyləmsi ilə bilinir. Bəzi hədislər müəyyən səbəblərə görə söylənmişkən, bütün hədislərin də vürud səbəblərini axtarmağa ehtiyac yoxdur. Çünki əksər hədislər Hz. Peyğəmbərin söhbətləri və verdiyi tövsiyyələri çərçivəsində ifadə edilən sözlərdir. Hərçənd Hz. Peyğəmbərin bütün söz və əməllərinin nə məqsədlə ifadə edildiyi bilinmir, ancaq hər söz və əməlinin bir məqsədi vardır. Bəzi hədislər vürud səbəbləri söylənməmiş və ya uydurulmuş ola bilər. ancaq vürüd səbəbləri ilə əlaqəli rəvayət edilən səhih rəvayətlərin, hədisləri doğru anlamada danılmaz əhəmiyyəti vardır.

### B. HƏDİSLƏRİ ANLAMADA MÜASİR ELMLƏRİN TƏSİRİ

İslam alimləri hədisləri düzgün anlamaq üçün yaşadıqları dövrün elmlərindən istifadə etmişdir. Məsələn, kəlam və əqaid elmi sünnənin əqidəvi yönünü, fiqh elmi ibadətlərlə əlaqəli məsələləri incələmişdir. Ayrıca tarix, təfsir və siyər kimi elmlərin də hədislərin düzgün analiz edilməsində müstəsna yeri olmuşdur.

Hz. Peyğəmbərdən günümüzə qədər çatan hədis və sünnə mədəniyyətini doğru başa düşüb izah etmək üçün bəşəri və sosyal elmlərdən yararlanmaq lazımdır. Çünki insan mərkəzli elmlər keçmişdəki müəyyən cəmiyyətin fərdlərinə aid söz və tətbiqatları o günkü ictimai, siyasi, iqtisadi və mədəni şərtləri diqqətə alaraq dəyərləndirməyə kömək edər. Məsələn hədislərə İslamdan əvvəlki din və mədəniyyətlərdən sirayət edən ünsürləri müəyyənləşdirmək üçün dinlər tarixi, etnololgiya, antropologiya, arxeologiya və tarix elmələrindən yararlanmaq lazımdır. Həmçinin Hz. Peyğəmbərin yaşadığı cəmiyyəti və bu cəmiyyətin inkişaf və tərqqisini anlamaq üçün sosyologiya və sosyal-psixologiya elminə ehtiyac vadır.

Hədislərin anlaşılmasında tarix və coğrafiya elmlərinin də müstəsna yeri vardır. Hz. Peyğəmbərin ömür boyu söylədiyi sözlərin və etdiyi hərəkətlərin tarixi yönünü müəyyənləşdirmək üçün mütləq tarix elmin müraciət etməliyik. Hədis və sünnənin tarixi məzmununu o dövrün ictimai münasibətləri, digər din mənsublarının fikir və düşüncələri, Ərəblərin İslamdan öncəki adət ənənə və inancları təşkil edir. Tarixi məzmunun qavranmasında o dövrlə əlaqəli tarix bilgisinə sahib olmaq lazımdır. Yeri gəlmişkən qeyd edək ki, uydurma hədislərin əksəriyyəti tarixi hadisələrlə əlaqəlidir. Bu hadisələrin həqiqətlərini tarix elmi sayəsində öyrənib mövzu hədisləri üzə çıxarmaq mümkündür.

Hədislərdə adı qeyd edilən məkanların yerlərini müəyyənləşdirmək üçün coğrafiya elmindən faydalanmaq lazımdır. O günki Ərəb cəmiyyətinin ictimai və yerli xüsusiyyətlərindən bəhs edən rəvayətləri anlamaq üçün də mütləq mədəni antropotologiya və xalq bilim sahələrindən istifadə edilməlidir. İqtisadi və siyasi məzmunlu hədisləri analiz etmək üçün iqtisadiyyat və siaysət elmlərinə ehtiyac vardır. Hz. Peyğəmbər ətrafındakı insanların vəziyyətlərini nəzərə alaraq fərqli-fərqli tövsiyyələr vermişdir. Belə hədislərin düzgün başa düşülməsi üçün mütləq psixologiya elmindən faydalanmaq lazımdır.[94]

*"Müsəlman, digər müsəlmanların dilindən və əlindən zərər görmədiyi kimsədir. Muhacir isə, Allahın qadağan etdiyi işlərdən uzaq duran kimsədir."*

(Buxari, İman 4-5, Riqaq 26; Müslim, İman 64-65; Əbu Davud, Cihad 2; Tirmizi, Qiyamət 52, İman 12; Nəsai, İman 8, 9, 11)

94 İsmail Hakkı Ünal, Hədis, s. 86.

Hz. Peyğəmbərin hədislərində qeyd olunan tibb və sağlıqla əlaqəli tövsiyyələrinin anlaşılması önəmlidir. Odur ki, o dövrün tibb elmi sahəsindəki həqiqətləri öyrənmək üçün tibb tarixi barəsində məlumatlara ehtiyac vardır. Eyni zamanda hədis mətinlərindəki anlaşılması çətin kəlmə və ifadələri düzgün anlamaq üçün də o kəlmənin tarixi seyrini məna fərqliliklərini bilmək lazımdır. Bunun üçün də ədəbiyyat və filologiya elminə müraciət edilməlidir.

## C. SÜNNƏ VƏ HƏDİSİ ANLAMAQ ÜÇÜN BÜTÜNLÜK

Qurani-Kərimi öz bütünlüyü çərçivəsində anlamaq nə qədər əhəmiyyət kəsb edirsə hədis və sünnələri də öz bütünlüyü çərçivəsində anlamaq da o qədər önəmlidir. Hədis və sünnələri doğru anlamaq üçün Hz. Peyğəmbərin söz ve əməlləri arasındakı bütünlüyə diqqət yetirmək lazımdır. Odur ki, bir mövzu barəsində doğru qərara gəlmək üçün o mövzu ilə əlaqəli bütün hədislərə nəzər yetirmək labüddür. Çünki Hz. Peyğəmbər bəzən muxatablarının vəziyyətinə görə fərqli kəlamlardan istifadə etdiyi kimi məkanın şərtlərinə görə də fərqli tətbiqatlar etmişdir. Peyğəmbər (s.ə.s) bir çox mövzuda fərqli zaman və makana görə fərqli rəftar etmişdir. Məhz Peyğəmbərdən (s.ə.s) sonra ortaya çıxan məzhəblərin bənzəri mövzularda fərqli davranmaları onun bu yönünə işarə edir.



*"Bir şəxs üçün hər eşitdiyini söyləməsi günah olaraq kifayətdir."*

(Neysaburi, Müstədrək, Elm, hədis no. 385; Bəğavi, Şərh əs-sünnə, XIV, 319)

Mövzu ilə əlaqəli bütün hədisləri toplamaq düzgün nəticə əldə etmək üçün vacibdir. Məsələn, bir hədisdə iman etmənin gərəyi belə dilə gətirilir: ***"İman etmədikcə cənnətə girə bilməzsiniz. Bir-birinizi sevmədikcə də iman etmiş sayılmazsınız"*** (Müslim, İman 37). Bu hədisdə cənnətə girmək üçün imana ehtiyac olduğu və həqiqi mənada iman etmək üçün də bir-birini sevməyə ehtiyac olduğu vurğulanmışdır. Bu mövzu ilə əlaqəli digər hədisləri nəzərə almadan bu hədisə yanaşmaq və cənnətə girmək üçün sadəcə iman edib başqa bir şeyə ehtiyac olmadığını düşünmək eyni zamanda imanı da sadəcə sevgidən ibarət görmək doğru deyildir.

Habelə böyük günahlar barəsində də Peyğəmbərimiz (s.ə.s) fərqli zaman və fərqli məkanlarda fərqli cavablar vermişdir. Belə hallarda verilən bütün cavabları toplayaraq bir bütünlük daxilində dəyərləndirmək doğru nəticələr verəcəkdir.

